Education is important for young people because it provides youth with tools and critical skills to gain employment and provide for themselves and their families in the future. Education also helps bring awareness to economic growth, environmental issues and sustainability. Young people who are educated know how to fight the spread of diseases, improve their health and the health of the community, and better care for themselves and their families. Education is the key to move in the world, seek better jobs and ultimately succeed in life. Education is the best investment for the people because well-educated people have more opportunities to get a job, which gives them satisfaction. Educated individuals enjoy respect among their colleagues and they can effectively contribute to the development of their country and society by inventing new devices and discoveries. Main purpose of education is to educate individuals within society, to prepare and qualify them for work in economy as well as to integrate people into society and teach those values and morals of society. Role of education is means of socializing individuals and to keep society smoothing and remain stable. Education in society prepares youngsters for adulthood so that they may form the next generation of leaders. One of the education essential tasks is to enable people to understand themselves. Students must be equipped with knowledge and skills which are needed to participate effectively as member of society and contribute towards the development of shared values and common identity.

Education serves as the means to bring about the desired change in society, to develop a generation of virtuous individuals and thus contribute to the development of good human beings. The fundamental purpose of education is to gain knowledge, inculcate the forms of proper conduct and acquire technical competency. Education serves as the means to develop oneself physically, mentally and socially.

The first thing that strikes me about education is knowledge gain. Education gives us a knowledge of the world around us and changes it into something better. It develops in us a perspective of looking at life. It helps us build opinions and have points of view on things in life. People debate over the subject of whether education is the only thing that gives knowledge. Some say education is the process of gaining information about the surrounding world while knowledge is something very different. They are right. But then again, information could not be converted into knowledge without education. Education makes us capable of interpreting things, among other things. It is not just about lessons in textbooks. It is about the lessons of life. One thing I wish I can do is, to provide education for all: no child left behind and change the world for good!

Education develops a country’s economy and society; therefore, it is the milestone of a nation’s development. Education provides knowledge and skills to the population, as well as shaping the personality of the youth of a nation.

Education is very important for an individual's success in life. It can give a big impact on human opportunity in continuing their life quality. Education is generally seen as the foundation of society, which brings economic wealth, social prosperity and political stability. Economic and social status depends on education obtained by individual since education contributes to individual capability in managing quality of life. It can help one’s individual to avoid from poverty, build up harmony and democracy society. Education means a change in man's conduct of life. It means the upgrading of a man's ability to choose the best alternative available in any circumstance he faces. It means the development of the person to prepare him to adopt the best approach to a problem at any given time. Education defined as 'adjustment ability to a changing situation and environment'. Education is more than an economic investment: it is an essential input upon which life, development and the survival of man depend. We all know that it is the responsibility of everyone in a country to educate; whether we are parents, adults, children, or teachers, in the public or private sector, education is the responsibility of everyone. However we see the needs and problems, most of us would agree that the role of education is to help provide the opportunity for all people to develop as fully as possible.

Without education, ones self-esteem is not as strong as a person who acquires knowledge in education. Obviously, education has a very important role in transmitting and fostering values that determine, in turn, behaviors, attitudes, reactions specific of responsible citizens.

All members of society including teacher, educational facilities and government’s commitment need to get involved in improving education. For instance teachers also must have a strong identity and at the same time strong commitment in cultivating the sense of identity to the students. The government needs to play an important role in the development of national education. It includes provide adequate education, take care of teacher’s welfare and avoid making education as a political medium.

As a conclusion, education plays a significant role in achieving a good quality of life. It is because education is importance guidance in human’s life. It can be regarded as important medium in changing the paradigm shift in one’s individual. Generally, education is always associated with the process of delivering skill, disseminating knowledge and internalizing value. Practically, individual who equipped with knowledge

can be able to internalize and apply the knowledge in every day's life. In children's context, education can be seen as continuing process of their development, so that they can practice and apply their knowledge as preparation in the future. Thus, education is major aspect of development of any modern society since if there is a deficit of educated people then society will stops its further progress. Their development, so that they can practice and apply their knowledge as preparation in the future.

Education is a ray of light in the darkness. It certainly is a hope for a good life. Education is a basic right of every Human on this Planet. To deny this right is evil. Uneducated youth is the worst thing for Humanity. Above all, the governments of all countries must ensure to spread Education.

## References

1. Charles, G. & Albert, A. (1999). Psychology an Introduction. Ed. Ke-10. Prentice Hall: New Jersey.
2. Maseko, J. & Rachofsky, A. (2003). Financing adequate education in Rural Setting. Journal of Education Finance, 29 Fall, 137-156.
3. Makarov Redshank. (2001). Psychology Social. Penerbitan Putter Malaysia. Serdang , Selangor.
4. Nik Sariah Karim. (2006). Camus Dewan Bahasa Dan Postoak. Kuala Lumpur. Dewan Bahasa Dan Postoak.
5. Paul B.H. & Chester L.H. (1994). Sociology. USA: McGraw Hill Book Company.
6. Pelan Inuk Pembangunan Pendelikon. (2006-2010). Memphian Negara Bangs.
7. Preston, S.H. & Ello I.T. (1996). Survival after age 80: letter to the editor. New England Journal of Medicine, 334 (8), 53

**Rəyçi: N.Seyidova**

Göndərilib: 04.02.2021 Qəbul edilib: 07.02.2021

DOI: 10.36719/2663-4619/63/28-33

**Qalibə Əli qızı Hacıyeva**
Naxçıvan Dövlət Universiteti
filologiya üzrə fəlsəfə doktoru, dosent
oguz.haciyev@gmail.com

# AZƏRBAYCAN-TÜRK ONOMASTİKASINDA KİMMERLƏRİN TARİXİ İZLƏRİ

***Açar sözlər:*** *Azərbaycan, Türk, onomastika, Kimmer, Qəmərli, etnonim, toponim*

## Historical traces of Cımmerıans in Azerbaijani-Turkic onomastics

**Summary**

Ethnonyms and historical-geographical names that reflect the names of these ethnoses are also part of the language's interesting vocabulary groups. Without etnonyms or toponyms, it is impossible to get detailed information about the formation of any people. That is why ethnotoponyms in the onomastic system of language are considered to be the oldest lexical units. It is clear from the studies that the history of the origin of many ethnotoponyms belonging to the Turkic language is older than the history of written monuments belonging to this language. Each nation has given its name to the geographical objects since its formation, or named them with words belonging to its own language. As a result, each toponym, is a product of a certain period and keeps the traces of history. Avshar, Az, Alpout, Bayat, Bayandir, Cagatay, Chepni, Chinchavat, Chul, Khalaj, Khurs, Kulus, Kechili, Kangar, Mugan, Garakhanli, Kipchak, Padar, Pechenek, Turkesh, Sag, Sungur, Suvar, Oguz, Uz and hundreds of other such ethnotoponyms bear traces of ancient time in the modern stage of Azerbaijan toponymy.. Among these ethnotoponyms, the Cimmerians // Gamarli tribe is one of the tribes that bear the traces of history in Azerbaijani-Turkic onomastics as both ethnotoponyms (Gamardash-mountain in Lachin region; Gamarvan-village in the administrative-territorial unit of Gabala region; Gamarvan - river in Gabala region, Gamarli-region in Armenia) and anthroponyms (Gamar - person's name; Gamarli-surname).

***Key words:*** *Azerbaijan, Turkic, onomastics, Cimmerians, Gamarli, ethnonym, toponym*

## Giriş

Hər bir xalqın təşəkkülü və formalaşması tarix boyu davam edən arasıkəsilməz etnik proseslərin nəticəsində baş verir. Müəyyən tarixi proseslərdə etnik mənsubiyyətcə qohum tayfaların konsolidasiyası və yaxud assimilyasiyası müxtəlif etnoslar arasında gedən prosesdə ya onlardan birinin digərini tarix səhnəsindən çıxararaq, özü isə hakim mövqeyə malik olur, ya da başqa adla bir etnos onun yerini tutur. Məhz buna görə də hər bir xalqın mənşəyini araşdırarkən, ilk növbədə o xalqın yaşadığı arealda baş verən etnik prosesləri bütün tarixi mərhələlər üzrə ardıcıl olaraq izləmək lazımdır. Başqa sözlə, müasir Azərbaycan xalqının tarixi mənşəyini öyrənmək üçün onun təşəkkül tarixinə diqqət yetirmək əsas şərtdir. Bunun üçün ilk növbədə qədim mənbələrdə adı keçən, tarix səhnəsindən çıxmış bir çox qədim etnosların müasir dövrdə Azərbaycan ərazisində mövcud toponimlərdə izini axtarmaq lazımdır. Güneyli, qüzeyli bütöv Azərbaycan əarzisindəki mövcud toponimik faktlar əsasında azərbaycanlıların etnogenezində iştirak etmiş etnosların yayıldığı areal əsasında həm də Azərbaycanın tarixi coğrafi sərhədlərini müəyyənləşdirmək mümkündür.

Vaxtı ilə azərbaycanlıların etnogenezində iştirak etmiş, tarixi e.ə. gedib çıxan bir çox qədim Türk tayfalarının adını əks etdirən müxtəlif növ onomastik vahidlərin (toponim, hidronim, antroponim və s.) müasir dövrdə Azərbaycan ərazisində qeydə alınması faktı müasir azərbaycanlıların etnogenez problemlərinin həllində mühüm rol oynayır. Bu gün Qüzey Azərbaycanda mövcud Alpaut, Avşar, Aza, Bayat, Bəydilli, Biçənək, Çaxırlı, Eymur, Gərgər, Xələc, İlanlı, Keçili, Kəngərli, Kəpənəkçi, Kolanı, Külüs, Qacar, Qaraxanbəyli, Qaşqaçay, Qazançı, Qəmərvan, Qıpçaq, Quşçu, Muğanlı, Oğuz, Padar, Sarıcalı, Tatar, Təklə, Türklər, Türkoba, Unus, Üstüpü və s., Güney Azərbaycanda Az//Əs, Arşaq, Bəyat, Bəyandur, Əfşar, Xalac, Kəmər, Sefidkəmər, Siyahkəmər, Qaşqay, Qacar, Qıpçaq, Pirsəğa, Biləsuvar, Türkənbur, Türkman, Üzərli, Kamus, Uzbeygi və s. bu kimi bir çox etnotoponimlərin mənşəyinin araşdırılması müasir Azərbaycan-Türk onomastikasının e.ə. dövrlərə aid erkən qatlarının müəyyənləşdirilməsinə imkan yatradır.

***Kimmerlər tarixi mənbələrdə.***

Qədim mənbələr əsasında aparılan tarixi onomastik tədqiqatlardan aydın olur ki, müasir Azərbaycan-Türk onomastikasında hələ də tam şəkildə tədqiq olunmamış qədim dövrlərə aid etnonimlər çoxluq təşkil edir. Bu etnonimlərdən biri də tarixi e.ə. dövrlərə gedib çıxan və çağdaş Türk xalqlarının, xüsusilə müasir azərbaycanlıların etnogenezində mühüm rol oynamış və müasir Azərbaycan-Türk toponimiyasında *Qəmərli,*

*Kəmər, Kəməraltı bazarı, Kəməri çayı, Kuhkəmər Sefidkəmər, Kəmərdərq* və s. bu kimi toponimlərdə və *Qəmər* kimi antroponimlərdə öz tarixi izini mühafizə edən qədim etoslardan biri olan Kimmer//Qəmərlərdir. Lakin təəssüflə qeyd etmək lazımdır ki, bir çox rusdilli tədqiqatlarda Kimmerlərin irandilli olması fikri yürüdülür. Bu yanlış mülahizəyə M.İ.Artomonov və V.İ.Abaevin tədqiqatlarında rastlaşırıq (Абаев В.И. 1965: c.126). M.İ.Artomonov Kiçik Asiyada Kimmerlərin üç böyük rəhbərinin - Teuşpa, Liqdamis (Tuqdamme), Sandakaşatrunun, eləcə də skif və sarmatların irandilli olduğunu göstərmişdir (Артамонов М.И. 1974: c. 21).

Bəzi araştırmalarda Kimmerlər Avropeid irqinə mənsub olan bir xalq kimi tədqdim olunsa da, bəzən də onların Kelt və ya Trakyalılarla qohumluğu, hətta ermənilərin babaları olaraq göstərilir. Bəzən də bir qrup araşdırmaçılar arasında Kimmerləri irandilli Skiflərin bir qrupu və ya Bulqarların babaları hesab edənlər də var (Tellioğlu İ. 2004: s.15). Dünya siyasətində tarix boyu Türk xalqına qarşı aparılan antitürk siyasəti nəticəsində siyasi-ideoloji məqsədlərlə bəzən müasir Azərbaycan türklərinin etnogenez tarixinə kölgə salmağa çalışan bəzi tədqiqatçıların bu kimi qərəzli, yanlış mövqeyinə baxmayaraq, qədim tarixi mənbələrdəki mövcud tarixi faktlar və bu faktlar əsasında müasir Azərbaycan onomastik sistemində mövcud leksik vahidlər Kimmerlər haqqında yürüdülən bütün saxta və uydurma iddiaları tamamilə təkzib edir. Bu müstəvidən yanaşdıqda, Kimmerlərin milli mənsubiyyəti haqqında müasir dövrün bir sıra tədqiqatlarında verilən bəzi məlumatlarda onların iarandilli xalq adlandırılması heç də təəccüb doğurmur.

M.Taner Tarhan isə Kimmerlər kökəni haqqında daha doğru qənaətə gəlmiş, onların etnik baxımdan ya Orta Asiya mənşəli Ural-Altay kökənli bir toplum və ya proto-Türklərin bir parçası olduğunu göstərmişdir: "Kimmerlər Orta Asiya mənşəyinə dayanan kurgan kültürlərinin tipik bir təmsilçisidirlər. Bozkırların geniş sahələrinə yayılmış olan süvari tayfalar mədəniyyətinin böyük batı qolunu təşkil edərlər. Kimmer-Skif mədəniyyətinin yaxın bağları və bunların bir-birindən ayrıd edilməyən kültür bərabərliyi, Kimmerlərin mənşəyi haqqındakı mübahisələrə aydınlıq gətirir" (Tarhan M.T. 1979: s.355-360).

Azərbaycan, eləcə də çağdaş Türk xalqlarının yaşadığı çox böyük bir coğrafiyada e.ə. dövrlərə aid ən qədim türk tarixinin izini müasir tarixi mərhələdə bir çox coğrafi adlarda yaşadan və Osmanlı dörünün müfəssəl və icmal dəftərlərində adı Qəmərli şəklində etnooykonim kimi qeyd olunan Kimmerlər haqqında müxtəlif mənbələrdə verilən məlumatlardan aydın olur ki, onlar Azərbaycanlıların etnogenezində iştirak etmiş ən qədim türk tayfalarından biridir. Karoly Czegledynin fikrincə, Kimmerlərin dünya tarixində belə önəmli bir yerə sahib olması Macarıstandan Çin Səddinə qədər uzanan ucsuz-bucaqsız bozkırlara hakim olan ilk köçəri tayfalar olmasından qaynaqlanır (Karoly C. 1998: s.13-14). R.Groussetin tədqiqatlarına görə, Qaradənizin qüzeyindəki bölgələrdə Kimmerlərə aid olan xeyli sayda arxeoloji tapıntılar, onların tarixini e.ə. XI əsrlərə qədər geriyə götürür (Grousset R. 1980: s.22-23 ). İ.Tellioğlu isə Orta Asiya mənşəli Kimmerlərin e.ə. 1800-1700-cü illərdə ana yurdlarından batıya doğru köç edərək Qafqazın şimalındakı bozkırlarda 500 illik bir hakimiyyətə sahib olmuşlar (Tellioğlu İ. 2004: s.15).

Bəzi mənbələrdə Kimmerlərin adı Nuh tufanından sonra insanlığın yenidən dünyaya yayılması ilə bağlı Tövratda Yasəfin oğulları arasında Gomer adı ilə qeyd olunur (Sandalgian J. 1917: s.370). Ərəb qaynaqlarına istinad edən İ.Tellioğlu Kimmerlərin adının bu qaynaqlarda Qumari, Qomer, Kimal//Qimal//Qimial və ya Kimmal şəklində qeyd olunduğunu göstərməkdədir (Tellioğlu İ. 2004: s.14) (Ebu Ömer-i Osman. 1970: s. 870). Erməni mənbələrində Kimmerlər Kamir, Qamir, Qimir, Qomer kimi qeyd olunduğu halda (Langlois V. 1880: s.24-25), Assur mənbələrində Qimirri (Georges I. 1969: s.62), yunan və müasir Avropa tədqiqatçılarının əsərlərində isə bu etnos Kimmer şəklində qeyd olunmuşdur (Herodot Tarihi. 1991: s. 18,21); (Strabon. 1969: s.22); (Charles B., Lang. D.M. 1971: s. 183); (Richard N.F. 1962: s.66).

Bir çox qaynaqlarda da Kimmerlərin yayıldığı coğrafiyanın çox geniş bir ərazini əhatə etdiyini, Macarıstandan Çin səddinə qədər uzanan Bozkırlara hakim mövqedə olduqları haqqında da geniş məlumat verilir (Károly C. 1998: s.13-14). Groussetin tədqiqatlarının nəticəsinə görə, Qaradənizin şimalındakı bozkırlarda Volqa və Ural bölgələrində arxeoloji qazıntılar zamanı e.ə. 1300-1200-cü illər arasındakı tarixlərə Kimmerlərə aid əldə edilən tarixi materialların hamısı Türküstanla bağlıdır (Grousset R. 1980: s.22-23).

Erməni mənbələrində Kamir//Qamir//Qomer kimi müxtəlif fonovariantlarda adı keçən Kimmerlərin Kapadokiya bölgəsindəki hakimiyyətləri haqqında çox dəyərli məlumatlar vardır. Erməni Moise Xorenin verdiyi məlumata görə Kapadokiya bölgəsi daxil olmaqla geniş bir ərazini hakimiyyət altında saxlamış Kimmerlərin adı fransız qaynaqlarında Kamirlər şəklində açıqlanır və bu bölgələr Kamir ölkəsi adlanır (Langlois V. 1879: s.24-25, 121). Bir çox erməni tarixinə həsr olunmuş əsərlərdə də bu fakt öz təsdiqini tapır və Kapadokiya Qamr bölgəsi kimi qeyd olunur (Stephanos O. 1866: s.173).

E.ə. (645-620) Asiyada skiflərin (Qaqlar) tabeliyində olan tayfalar haqqında məlumat verən Sandalgiyan müxtəlif mənbələrdə Qomer, erməni yazılarında isə Qamrik adlandırılan Kapadokiya xalqının-türklərin

Kimmerlər olduğunu qeyd edir. Erməni tarixçilərinin əsərlərində Qaradəniz sahillərində yayılan Kimmerlərin e.ə. VIII əsrdə Kırımdan Sinopa gəldikləri haqqında da məlumat verilir (Sandaljiyan L. 1917: s. 370; 346).

Anadolunun bütün bölgələrində olduğu kimi, Qaradəniz bölgəsində də iqtisadi-siyasi baxımdan böyük gücə malik olan Kimmerlər uzun müddət Sinopdan Trabzona qədər bölgələri hakimiyyətləri altında saxlamışlar (Tellioğlu İ. 2004: s.20). Bu səbəbdən də VII əsrdə yunanlıların bu əraziləri ələ keçirmək və öz koloniyalarını qurmaq iddiası baş tutmamışdır (Atasoy S. 1997: s.19). Mənbələrdən göründüyü kimi, Macarıstandan Çin səddinə qədər bozkırlarda hakim mövqeyə malik olan Kimmerlər yalnız Türk tarixində deyil ümumdünya tarixində də böyük rol oynamışlar. Türk mifologiyasındakı rəvayətlərə görə, ən qədim qaynaqlarda Kimmerlərin türk xalqlarının ulu əcdadları olması göstərilir (Ögel B. 1993: c.1, s.579). Tarixi araşdırmalarla yanaşı, onomastik tədqiqatlar zamanı Kimmerlərin adının istər antroponim (Qəmər şəxs adı; Qəmərli soyad), istər toponim (Kəmər kəndi, Kəməraltı bazarı, Kəmərli, Qəmərli və s.), istərsə də etnonim (Kimmer, Qəmərli) kimi ümumtürk onomastik sistemində böyük mövqeyə malik olması faktı bu fikri təsdiq edir.

Müasir dövrdə Türk xalqlarının yaşadığı müxtəlif coğrafiyalarda, Qaradınizin qüzeyində Kırım bölgəsində, Güney və Qüzey Azərbaycanda, Anadoluda, İrəvan Xanlığı ərazisində Kimmerlərin adını yaşadan xeyli sayda tarixi toponimlər qeydə alınmışdır: Kəmər, Kəməraltı bazarı-Türkiyədə, Qəmərlu-İndiki Ermənistanda, Kimmer boğazı, Kimmer qalaları – Kırımda, Kəmərli kəndi – Şimali Azərbaycanda, Kəmər, Kəməərdəq – Güney Azərbaycanın Xalxal şəhərinin Şahrud rayonunda (Hacıyeva Q. 2008, s.102).

F.A.Cəlilov bu tayfaların e.ə. minilliklərdə Kırım, Zaqafqaziya və Kiçik Asiyada məskunlaşdığını qeyd edərək müxtəlif dilli tarixi mənbələrdə onların Kimmer (yunan), Qimirri (assur), Qomer (bibliya), Qamir (erməni) formalarında işləndiyini göstərmişdir. Qəmərlərin Saklarla (Skiflərlə) qohumluğu barədə məlumat verən müəllif bu etnosun "igid, bahadır" anlamında bir çox xalqların dilində mühafizə olunub saxlandığını qeyd edir: rus dilində Koumir, osetin dilində Qaemri, gürcü dilində Qmrri (Cəlilov F. 1986: s. 85-82). Günümüzdə Quzey və Güney Azərbaycanda geniş yayılmış Qəmər antroponimi ilə yanaşı, Güney Azərbaycanda yaşayan qaşqay türklərinin tərkibində Kimmerlərin adı bir tayfa olaraq indi də qalmaqdadır. Qərbi Azərbaycan bölgəsində, indiki Yerevan yaxınlığındakı Qəmərli, Qəmərlu oykonimləri də bu tayfanın adı ilə bağlıdır.

Kırım tatar tarixçisi A.Memetov "Kırım tatarlarının mənşəyi və dili haqqında məqaləsində Kimmerlərin e.ə. Kırım ərazisində yaşadığını qeyd edir (Memetov A. 1994: s.4). Qaradənizin şimalında, eləcə də Ural və Volqaboyu ərazilərdə arxeoloji qazıntılar zamanı Kimmerlərə aid əldə edilən sərdabələr və digər maddi mədəniyyət nümunələri Kimmerlərin böyük Türküstanla bağlı olduğunu göstərir. Araşdırmalar göstərir ki, Kimmerlərə aid bu arxeoloji qazıntıların tarixi daha qədim dövrlərə, e.ə. XI əsrə qədər gedib çıxır (Grousset R. 1980: s.22-23). Müasir dövrdə Kırım ərazisində olan Bospor Kimmerski, Kimmer keçidi, Kimmer qalaları, Kimmerik etnotoponimlərinin adına qədim və orta əsr mənbələrində rast gəlinir. Kimmerlərin e.ə. Araz çayının cənubunda yaşadıqlarını qeyd edən Heredotun "Tarix"ində bu haqda daha müfəssəl məlumat verilir (Herododt, 1991: s.196). Bu etnotoponimlər yalnız Kırımda deyil, Azərbaycanda, xüsusilə güney Azərbaycanın Şərqi Azərbaycan bölgəsində daha çox qeydə alınmışdır. Tədqiqatlar zamanı etimoloji təhlillərdən aydın olur ki, Güney Azərbaycanda olan Kəməri çayı (hidronim), Kəmər, Kuhkəmər (Əhərdə), Kəmərdərq, Kəmər//Qəmər (Xalxalda), Sefidkəmər (Təbrizdə), Siyahkəmər (Miyanada) oykonimləri Qəmər// Kimmer tayfalarının adını əks etdirir (Hacıyeva Q. 2008: s.99).

Zeki Velidi Toğanın araşdırmalarında hələ e.ə. XII-VIII əsrlərdə Qaradənizin şimalında hakim mövqeyə malik olan Kimmerlərin Qafqaza doğru irəliləyərək e.ə. 714-cü ildə öncə Azərbaycana, sonra isə Urartu dövlətinə güclü zərbə vuraraq, oradan Şərqi Anadoluya girdikləri qeyd olunur (Toğan Z.V. 1981: s. 34). Mehmet Bilginin verdiği bilgilərə görə bundan sonra Kimmerlər daha geniş ərazilərə, Ege dənizi sahillərinə qədər yayılmışlar (Bilgin M.1999: s.49). Türkiyənin bir çox bölgələrində bu tayfanın adını yaşadan tarixi toponimlərdən biri məhz Ege dənizi sahilində yerləşən İzmir şəhərinin mərkəzindəki çox qədim tarixə malik memarlıq abidəsi olan Kəməraltı bazarıdır.

R.Eyvazovanın da tədqiqatlarında bu etnosla bağlı Əfqanıstanda bir neçə obyektin (Qərəkəmər mağara – Səmənqanın Aybək sahəsində: Qərə Qəmər sahə - Bədəxşanda) olduğu qeyd olunur. Bununla yanaşı, müəllif Heratda Qəmər adlı oronim haqqında da məlumat verir (Eyvazova R. 1995: s.196).

Bir çox xarici mənbələrdə Kimmerlərin Anadoluya gəlişindən sonra daha da gücləndikləri qeyd olunur. Assur kitabələrinə görə Kimmerlərin Cənubi Qafqazda görünməsi Sarqon hakimiyyətinin (e.ə. 722-705) son dövrlərinə təsadüf edir (Minns E.H. 1970: s.188). Skiflərin köç yolları üzərindən çəkilərək cənuba doğru hərəkət edən Kimmerlərin ilk yetişdiyi ərazi Gürcüstan düzənlikləri olmuşdur. Buraya gəlmələri ilə siyasi vəziyyəti kökündən dəyişdirən Kimmerlər Gürcüstanın Qaradəniz sahilindəki Kolhis krallığını devirdilər (Siharulidze Y. 1998: s.43). Gürcüstan ərazisində Kimmerlərin tarixi izini yaşadan toponimlərin bir qismi XVI-XVIII əsr Osmanlı qaynaqlarında da qeyd olunur. 1728-ci il tarixli "Tiflis əyalətinin müfəssəl dəftəri"

ndə İncə nahiyəsinə tabe olan Kəmərli qışlağının adı da Kimmerlərin adından yaranmışdır (Mustafayev Ş. 2001: s.187). Bundan əlavə, 1728-ci il tarixli "İrəvan əyalətinin müfəssəl dəftəri"ndə Kimmerlərin//Qəmərlilərin İrəvan əyalətinin Xınzrək və Karni nahiyələrinin Almalı Uğurbəyli, Yuva kəndlərində yaşadığı qeyd olunur (Bünyadov Z. 1996: s.37). Bu dəftərdə Sisyan nahiyəsində isə Kimmerlərin adını əks etdirən Əşkəmər adlı etnotoponim qeydə alınmışdır (Bünyadov Z.1996: s.145).

Gürcüstan tarixinin tədqiqatçıları Allen və Lanqın verdiyi bilgilərə görə Kimmerlərin axını Gürcüstanın sosial-mədəni həyatında son dərəcə böyük rol oynamışdır. Lang Kimmer və Skif köçlərinin Kolhis krallığı və şimal-şərqi Anadolu ilə Gürcüstanda yaşayan İber-Qafqaz xalqları üzərində uzunmüddətli hakimiyyətinin təsirinə məruz qaldığını göstərir. Bunun nəticəsi olaraq, müasir Gürcü xalqının əcdadlarının İber-Qafqaz qəbilələri dağlıq bölgələrə sığınmış, Med və Perslərin vassalları kimi yaşamağa məcbur olmuşlar. Lanqın verdiyi məlumata görə, bu təsir İber – Qafqaz xalqları ilə yanaşı, abxaz və meqrel xalqlarından da yan keçməmişdir (Lang D.M. 1997: s.67). Lang kimi, Burneyin də tədqiqatlarından aydın olur ki, erməni və gürcülər də uzun müddət Assur, Urartu və Babil dövlətlərini çökdürən Kimmer və Skiflərin hakimiyyəti altında olmuşlar. Gürcülərin Kimmerlərə qarşı mübarizəsi heç bir nəticə vermədiyindən, onların geri çəkilərək Qori yaxınlığındakı bölgədə ilk şəhərlərini qurmalarına səbəb olmuşdur (Burney Ch. 1971: s. 183-194).

Q.A.Melikaşvili Kimmerlərin Albaniyanın qərbində yaşadığını göstərir (Melikaşvili Q.A. 1954: s.134). Q.Qeybullayevin tədqiqatlarında isə Cənubi Qafqaza gəlmiş Kimmerlərin bir hissəsi Azərbaycanın qərb bölgəsində, Gürcüstanda və Ermənistanda həmişəlik məskunlaşmışlar. Tarixi tədqiqatlarda Qazax-Borçalı bölgəsində Böyük və Kiçik Kəmərli, Kəmırqaya və Qəmərli kəndlərinin adlarının da bu tayfanın adı ilə bağlılığı ortaya çıxır və XIX əsrdə Qafqazda Kəmərli adlı yeddi toponimin qeydə alındığı göstərilir. Bunlarla yanaşı, Yerevan yaxınlığında orta əsrlərdə Qumri, Qəmri (Qəmər etnoniminin ermənicə tələffüz forması) adlı azərbaycanlı kəndi olduğunu da qeyd edir (Qeybullayev Q. 1994: s. 132). Erməni tarixçisi Y.A.Manandyan da erməni mənbələrində Kumyar şəklində yazılan toponimin də Kimmerlərin adı ilə bağlı olduğunu göstərir (Manandyan Y.A. 1954: s.132, 21).

E.ə.709-cu ildə ilk dəfə Anadoluya gələn Kimmerlər Kapadokiyaya yerləşmişlər (Olmestead A.T. 1923). Kimmerlər Anadoluya girdikləri zaman bu dövrdə bütün Yaxın Şərqi bir bayraq altında toplamağa çalışan Assurlar Karqamış, Malatya, Maraş ilə Kilikya və Toros bölgəsindəki 24 şəhəri ələ keçirmiş olsalar da, daha sonra Kimmer təhlükəsi üzündən geri çəkilmişlər (Günaltay Ş. 1993: s.18). Richard Trye tədqiqatlarında Assur dövlətinin siyasi və etnik tarixində böyük rol oynamış Kimmerlərin e.ə. 696-695-ci illərdə orta Qızılirmağın qərbindəki Frikyaya hücum etməsi, mərkəzi Qordionu talaması haqqında məlumat verir (Richard T. 1962: s.71). Bəzi qaynaqlarda iverilən məlumata görə Kimmerlər tərəfindən Frikyanın dağıdılması və talan edilməsi kral Midasın intihar etməsinə səbəb olmuşdur (İplikçioğlu B. 1994: s. 770).

1728-ci Osmanlıların tərtib etdiyi İrəvan, Naxçıvan, Tiflis, Gəncə-Qarabağ əyalətlərinin müfəssəl və icmal dəftərlərində bu bölgələrdə qədim Türk tayfası Kimmerlərin adını əks etdirən bir neçə toponim qeydə alınmışdır. Müasir dövrdə Kimmerlərin adının ümumtürk onomastik sistemindəki mövqeyi, eyni zamanda tarixi toponim və antroponimlərdə əksi bu etnosun Türk xalqının tarixi ilə sıx bağlılığının inkarolunmaz təsdiqidir: Müasir Azərbaycan onomastik sistemində mövcud olan və antroponim kimi *Qəmər - şəxsi adı; Qəmərli-soyad,* toponim kimi *Kəmər kəndi, Kəməraltı bazarı, Kəmərli kəndi, Qəmərli* kəndi ya da etnonim kimi *Kimmer, Gamar* şəklində qeydə alınan bu onomastik vahidlər deyilənləri təsdiq edir. Maraqlı cəhət odur ki, müasir Azərbaycan onomastik sistemində antroponim və etnotoponim kimi qeydə alınan Kimmerlərin adı həm də oroim, hidronim kimi qorunub saxlanmaqdadır:

***Qəmərdaş*** – Laçın rayonunda dağ; ***Qəmərvan*** – Qəbələ rayonunun eyni adlı inzibati ərazi vahidində kənd; ***Qəmərvan*** – Qəbələ rayonu ərazisində çay (Ensiklopedik lüğət: 2007: s.51).

***Qəmərli*** — İrəvan Xanlığının Karbibasar mahalındakı ***Qəmərli*** kəndinin adı 1945-ci ilin 04 sentyabrına qədər Qəmerli, daha sonra erməniləşdirilərək Artaşat, Üçkilsə (Eçmiədzin) rayonundakı Qəmərli kəndinin adı isə Ermənistanın dövlət qərarı ilə 15.07.1946 ilində dəyişdirilərək Metsamor adlandırılmışdır (Ələkberli Ə. 1994: s.165), (Budaqov B, Qeybullayev Q.1998: s.199), (Bayramov İ. 2002: s.217).

***Qəmərli*** — Eçmiədzin rayonunda kənd. 1918-ci ildə yerli Azərbaycan türkləri buradan tamamən çıxarıldıqdan sonra Türkiyədən gətirilən ermənilər buraya yerləşdirilmişdir (Budaqov B.; Qeybullayev Q. 1998: s.199). İbrahim Bayramovun araşdırmalarında bu kəndin ikinci adı Gözlü Qəmərli olaraq qeyd olunur (Bayramov İ. 2002: s.2016). 1588-ci ilə aid mənbələrdə qışı Qarabağda, yazı isə İrəvanda keçirən Kamerlu-ye Atik, Kamerlu-ye Cədid Türk-müsülman tayfalarının adı qeydə alınmışdır (Budaqov B., Qeybullayev Q. 1998: s.199).

Əslən Qərbi Azərbaycandan olan olan Əziz Ələkbərlinin indiki Ermənistanın dövlət qərarları əsasında arxiv sənədlərinə istinadən verdiyi məlumatlarına görə ermənilərin antitürk siyasətinin nəticəsi olaraq Qəmərli rayonunun ərazisi dəfələrcə dəyişdirilmişdir. 1932-ci ilin inzibati bölgüsünə görə Qəmərli

rayonunda 102 yaşayış məntəqəsinin %75-də Azərbaycan türkləri yaşamışdır. Azərbaycan türklərinin bu birliyini dağıtmaq məqsədi ilə 1937-ci ildə Zəngibasar rayonun yaradılması ilə Qəmərli rayonundan 18 kənd alınıb bu rayonun ərazisinə qatılmışdır. 1948-1951-ci illərdə Rusiyanın dəstəyi ilə azərbaycanlıların bu ərazilərdən kütləvi deportasiyası ilə bağlı olaraq Zəngibasar rayonu yenidən qaldırılmış, əskidən Qəmərli rayonuna aid olan kəndlər yenidən bu rayonun ərazisinə qatılmışdır. 1969-cu illərdə Zəngibasar rayonunun yenidən yaradılması ilə Qəmərli rayonu inzibati ərazi baxımından yenidən dəyiştirilmişdir.

1964-cü ildə Azərbaycan Türklərinin deportasiya olunması ilə Vedi rayonunun da əhalisi tamamilə erməniləşdirilərək Qəmərli rayonuna birləşdirilmişdir. Qəmərli İrəvana yaxın və Ağrı vadisinin münbit torpaqlarında olduğundan 1948-1951-ci illərdə bu rayonun bütün kəndlərində yaşayan türklər buradan çıxarılmış və boşaldılmış kəndlərə müxtəlif xarici ölkələrdən gətirilmiş ermənilər yerleşdirilmiş, Çiləxanlı, Novruzlu, Qaraqoyunlu kimi bir çox dağlıq kəndlər isə dağıdılmış və xarabazarlığa çevrilmişdir (Ələkbərli Ə. 1994: s.89-93). (Budaqov B.; Qeybullayev Q. 1998: s.216) Sonradan Vedi rayonu yenidən bərpa olunaraq Qəmərlidən ayrılmış və Qəmərli adı dəyişdirilərək Artaşat adlandırılmışdır (Ələkbərli Ə. 1994: s.89-93).

## Nəticə

Tarixi mənbələr əsasında ortaya çıxan faktlar göstərir ki, tarixi e.ə. XI yüzilliklərə qədər gedib çıxan qədim Kimmerlərin Türk olmaları heç bir şübhə doğurmur. Bu fakt tarixi mənbələr əsasında verilən təhlillərdə öz təsdiqini tapır. Azərbaycanın müxtəlif bölgələrində Kimmerlərin adını əks etdirən coğrafi adların hər biri xalqımızın etnik tarixinin, xüsusilə etnogenez probleminin araşdırılması üçün zəngin informasiya verir. Bu isə onu söyləməyə əsas verir ki, dünya tarixində iz qoymuş hər bir etnosun mənşəyinin antik mənbələr əsasında tədqiqi, ilk növbədə Azərbaycan xalqının mənşəyi probleminin araşdırılması prosesində qarşıya çıxan çətinlikləri ortadan qaldırmış olur və Azərbaycan-Türk xalqına qarşı yönəldilmiş məqsədyönlü saxta konsepsiyaların qarşısını alır.

## Qaynaqlar

1. Абаев В.И. Скифо-Европейские изголоссы на стыке Востока и Запада. Москва: «Наука», 1965.
2. Allen W.E.D. A History of the Gergian People. London: 1971.
3. Артамонов М.И. Киммерийцы и скифы. Ленинград: изд.-во ЛГУ, 1974.
4. Atasoy Sümer. Amisos. Samsun: 1997.
5. Azərbaycan toponimlərinin ensiklopedik lüğəti. 2 cilddə. Bakı: "Şərq-Qərb", 2007.
6. Baheddin Ögel. Türk Mitolojisi. c.I. Ankara: 1993.
7. Bayramov İ. Qərbi azərbaycanın Türk mənşəli toponimləri. Bakı: "Elm", 2002.
8. Budaqov B.Ə. Türk uluslarının yer yaddaşı. Bakı: "Elm", 1994.
9. Budaqov B.Ə., Qeybullayev Q.Ə. Ermənistanda Azərbaycan mənşəli toponimlərin izahlı lüğəti. Bakı: "Oğuz eli" 1998.
10. Caferoğlu A. Türk Kavimleri. İstanbul: Enderun kitapevi, 1988.
11. Charles Burney-David Marshall Lang. The people of the Hills. London: 1971.
12. Cəlilov F.A. Qədim Türk etnonimləri. AOP-a həsr olunmuş konfrans materialları. Bakı: APİ, 1986.
13. Ebu Ömer-i Osman Mevlânâ Minnhâc-ud-dîn Tabakât-i Nâsirî II (nşr. M.H.G.Ravety) New Dehli: 1970.
14. Eyvazova R.H. Əfqanıstanda türk mənşəli toponimlər. Bakı: "Elm", 1995.
15. Ələkbərli Ə. Qədim Türk-Oğuz yurdu-Ermənistan. Bakı: "Sabah" 1994.
16. Georges I. Bratianu. La Mer Noire. München: 1969.
17. Günaltay M.Ş. Yakın Şark II Anadolu. Ankara: TTKB, 1987.
18. Grousset René. Bozkır İmperatorluğu. (nşr. M.R.Uzmen) İstanbul: 1980.
19. Hacıyeva Q. Cənubi Azərbaycan toponimləri. Bakı: "Elm" 2008.
20. Herododtus. Herodot Tarihi. (nşr. M.Ökmen.) İstanbul: 1991.
21. İplikçioğlu Bülent. Eskiçağ tarihinin Ana Hatları. İstanbul: 1994.
22. İrəvan əyalətinin icmal dəftəri. Araşdırma, şərh, və tərcümə Z.Bünyadov və H.Məmmədovundur. Bakı: "Elm", 1996.
23. Károly Czrglédy. Bozkır Kavimlerinin Doğudan Batıya Göçleri (nşr. E.Çoban) İstanbul: 1998.
24. Kitab Mukaddes, Tekvin Bap 10. İstanbul: 1995.
25. Qaramanlı (Məmmədov) H. Gəncə-Qarabağ əyalətinin müfəssəl dəftəri. Bakı: "Şuşa", 2000.
26. Qeybullayeb Q.Ə. Azərbaycan türklərinin təşəkkülü tarixindən. Bakı: Az.Döv. nəşriyyatı, 1994.
27. Qeybullayev. Q.Ə. Qədim Türklər və Ermənistan. Bakı: "Azərnəşr", 1992.
28. Qurbanov A. Azərbaycan dilinin onomalogiyası. Ali məktəb üçün vəsait. Bakı: "Maarif", 1988.
29. Langlois Victor. Collection des Historiens Ancines et Modernes de l'Armenie II. Paris: 1879-1880.

30. Lang D.M. Gürcüler. (nşr.N.Domaniç). İstanbul:1997.
31. Lori vilayətinin icmail dəftəri. Ön söz, mətnin tərtibi, tərcümə və qeydlərin müəllifı tarix elmləri namizədi Şahin Mustafaye v Bakı: "Nurlan", 2004.
32. Манандян Я.А. О торговле и городах Армении в связи с мировой торговлей древних времен. Ериван: 1954
33. Меметов А.О. О происхождении Крымских татар и их языка Журнал «Гасавет» Кырым: 1994.
34. Mehmet Bilgin. Doğu karadeniz Bölgesinin Etnik Tarihi Üzerine. Trabzon tarihi. Bildiriler. Trabzon: 1999.
35. Minns E.H. The Seythines and Northen Nomads. The Cambrige Ancinet Histori, III. Cambrige: 1970.
36. Mustafayev Ş.Tiflis əyalətinin müfəssəl dəftəri (Borçalı və Qazax 1728-ci il). Bakı: "Pedaqogika", 2001.
37. Naxçıvan sancağının müfəssəl dəftəri. Araşdırma, qeyd və şərhlərin müəllifi H.Məmmədov, Tərcümə edənlər Z.Bünyadov və H.Məmmədov. Bakı: "Elm", 2001.
38. Nəcəfli T. Gəncə - Qarabağ əyalətinin icmal dəftəri. Bakı: "Çaşıoğlu", 2010.
39. Olmestaed A.T. The Assyrians in Asia Minor. AS (W.M.Ramsay Armağanı, nşr. W.H Bucler- W.M.Calder) 1923.
40. Richard N. Frye. The Heritage of Persia. London: 1962.
41. Sandaljian Lospen. Historie Documentarie De l'Armenie. I. Rome: 1917.
42. Siharulidze Y., Manevaşvili A. Trabzon'dan Abhazya'ya Doğu Karadeniz Halklarının Tarih ve Kültürleri. (nşr. H,Hayrioğlu). İstanbul:1998.
43. Stephannos Orbelian. Historie De la Sioune II. Saint-Peterbursq 1886.
44. Strabon. Coğrafiya. Kitap XII, Bölüm I, II, III (nşr. A.Pekman) İstanbul: 1969.
45. Tarhan M.Taner. Eskiçağda Kimmerler Problemi. VII.Türk Tarih Kongresi (Ankara: 11-15 Ekim 1976). Kongreye Sunulan Bildiriler III Ankara: 1979 355-360 s.
46. Tellioğlu İ. Osmanlı Hakimiyetine Kadar Doğu Karadeniz'de Türkler. Trabzon: 2004.
47. Toğan A. Zeki Velidi. Ümumi Türk Tarihine Giriş I. İstanbul: Enderun kitapevi, 1981.
48. Vəlixanlı N.M. IX-XII əsr ərəb coğrafiyaşünas səyyahları Azərbaycan haqqında. Bakı: "Elm", 1974.

**Rəyçi: prof.Ə.Quliyev**

Göndərilib: 23.02.2021 Qəbul edilib: 26.02.2021

DOI: 10.36719/2663-4619/63/34-36

**Məlik Şıxbala oğlu Məlikov**
Azərbaycan Dövlət Pedaqoji Universiteti
pedaqogika üzrə fəlsəfə doktoru, dosent
melikmelikov1960@mail.ru

# SAĞLAMLIQ İMKANLARI MƏHDUD UŞAQLARLA İŞDƏ AKTİV TƏLİM METODLARINDAN İSTİFADƏ

***Açar sözlər***: *inklüziv təhsil modeli, sağlamlıq imkanları məhdud uşaqlar, aktiv təlim metodları, təlim texnologiyaları, analitik fəaliyyət, pedaqoji problem*

**Technologies of active teaching methods at work with children with disabilities**

**Summary**

The article discusses the technologies of active teaching methods used when working with children with disabilities. It is concluded that in inclusive education it is possible to use technologies of active teaching methods, consisting of information and communication technologies, when working with children with disabilities. At the same time, the teacher must learn to choose active teaching methods depending on the subject, age, individual characteristics of students, adapt to the content of educational materials, the purpose of the lesson, not take into account their professional level, interact with parents and not meet with support specialists. the importance of.

***Key words:*** *inclusive education model. children with disabilities, active learning methods, learning technologies, analytical activities, pedagogical problem*

İnklüziv təhsil modelində uşaqların inkişaf səviyyəsi fərqlidir, bu da nəticədə şəxsiyyətin intellektual dəyişməsini deyil, onun sosial dəyişikliyini nəzərdə tutur. Ancaq eyni zamanda, hər hansı bir uşaq həm idrakın, həm də fəaliyyətin subyerktidir. Buna görə müəllimin əsas vəzifəsi-inkişafetdirici xüsusiyyət daşıyan sistemli və məqsədyönlü təlim yolu ilə şagirdlərdə sabit intellektual fəaliyyət formalaşdırmaqdır. Dövlət Təhsil Standartlarının əsasını təşkil edən sistem-fəaliyyət yanaşması "hər bir şagirdin (istedadlı və SİM uşaqlar da daxil olmaqla) fərdi xüsusiyyətlərinin nəzərə alınmasını, yaradıcı potensialınının, idraki motivlərinin artmasını, idrak fəaliyyətində həmyaşıdları və böyüklərlə qarşılıqlı əlaqə formalarının zənginləşdirilməsini nəzərdə tutur. İdrakı fəaliyyətin tərkib hissəsi təlim metodlarıdr. Müəllim metodları seçərkən hər şeydən əvvəl təlimin məqsədinə və məzmununa diqqət yetirməli; metodları müəyyən pedaqoji problem ilə, sağlamlıq imkanları məhdud şagirdlərin fiziki və psixi xüsusiyyətləri ilə əlaqələndirməli; şagirdin ümumi təlim və spesifik bacarıqlarının inkişaf və formalaşma səviyyəsini müəyyənləşdirməlidir.

Sağlamlıq imkanları məhdud uşaqlarla işləyən müəllimlər dərslərdə və məşğələlərdə aktiv təlim metodları (ATM) texnologiyalarından istifadə edirlər. Bu texnologiyalar fəallığı və sinifdə şagirdlərin müxtəlif əqli və praktik fəaliyyətlərini təmin edir. Aktiv təlim metodları sinifdə oyun hərəkəti, yaradıcı təlim, ünsiyyət, tədqiqat fəaliyyətinin təşkilinə imkan verir ki, bu da təlim prosesinin keyfiyyətini, səmərəliliyini və şagirdlərin sosiallaşmasını təmin edir. Gəil bir neçə aktiv təlim metodunu gözdən keçirək.

S**ituasiya çalışmaları metodu** analitik fəaliyyətlə əlaqəlidir: sistemləşdirmə, ranqlaşdırma, hesablama, müqayisə, qərarlar qəbuletmə. Metodun əsas məqsədi bilikləri mənimsəmək və real təcrübəyə yaxın olan şəraitlərdə fəaliyyət əsasında peşə bacarıq və vərdişlərinə yiyələnməkdir. Bu metod ev tapşırıqlarının yerinə yetirilməsi üçün də istifadə olunur.

Situasiya çalışmaları metodu nitqin, işgüzar emosional ünsiyyətin inkişafına yönəldilmişdir. Müəllim, uşaqlar (sağlam və SMU) arasında ünsiyyətin zəruri olacağı vəziyyət yaradır. Nəticədə, şagirdlər müstəqil, fərdi şəkildə situasiya çalışmalarını yerinə yetirirlər. Problemin özünün bir çox həll variantları vardır. Şagirdlər öz variantlarını təqdim edirlər, bu zaman təkrarlamalar istisna olunur. Bu metod dərsin əvvəlində emosional ünsiyyəti inkişaf etdirmək üçün istifadə edilə bilər.

**Diskusiya metodu.** Müəllimin və ya şagirdlərin sualları (suallar əvvəlcədən evdə hazırlanır), düşünmə tələb etdikdə, dərsdəki şagirdlər sərbəst şəkildə çıxış edənlərin fikirlərini dinləyir və söylənənlərə öz fikirlərini bildirirlər. Bu metod təlimin differensiallaşmasına istiqamətlənmişdir.

**İstinad siqnal metodu** təhsil informasiyalarının yenidən kodlaşdırılmasına əsaslanır. İstinad siqnalı hər hansı bir təhsil informasiyasının mənasını əvəz edən qrafik işarədir (söz, rəqəm, şəkil, diaqram, ox). Belə metod sağlamlıq imkanları məhdud (diqqət çatışmazlığı sindromlu, hiperaktiv, eşitmə qüsuru) uşalqa məşğul olan müəllimə lazımdır.

**Dərsliklə müstəqil iş metodu** yeni materialı öyrənərkən tətbiq olunur, müəllim əvvəlcədən heç bir şey izah etmir. Şagirdlər mətni təhlil və tərkib, müqayisə, əsas və başlıca olanı qeyd etmək, konkretləşdirmə və ümumiləşdirmə əməliyyatları ilə əlaqəli tezislərə, plana, diaqramlara, cədvəllərə çevirirlər. Şagirdlər yalnız dərsliyin mətni ilə deyil, həm də ona aid olan rəsmlərlə işləyir və qısa məlumatlar da hazırlayırlar. Bu metod məntiqi təfəkkürü aktivləşdirir və inkişaf etdirir.

**Praktik iş metodu** bilik və bacarıqların dərinləşdirildiyi, idrak fəaliyyətinin stimullaşdırıldığı, nəzarət və korreksiya problemlərinin həll olunduğu nəzəriyyədən praktikada istifadə etmə bacarığına əsaslanır. Şagirdlər praktik işi fərdi, cütlükdə və ya qrup şəklində yerinə yetirirlər. Seçim həll ediləcək tapşırıqlardan və SİM şagirdlərin idrak fəaliyyətinə cəlb olunmasından asılıdır. Qrup işi şagirdlərə fikirlərini irəli sürməyə, təkliflər verməyə və müzakirələr aparmaq imkanı verir, sonda bütün qrup vahid bir nəticəyə gəlməyə səbəb olur. Bu səbəbdən SİM şagird, tapşırığı yerinə yetirməsə və ya səhv yerinə yetirmiş olsa belə, özünün digərlərindən fərqli olduğunu hiss etmir. Praktik iş metodu istisnasız olaraq bütün şagirdlərə informasiyalılıq, sosial, ümummədəni, kommunikativlak kimi əsas kompetensiyalara yiyələnməyə imkan verir.

**Laborator işi metodunu** tətbiq edərkən şagirdlər müstəqil şəkildə eksperiment, təcrübə, müşahidə aparan zamanı qismən yeni biliklər əldə edirlər. İşi yetirmədən əvvəl şagirdlər yalnız onun məqsədini bilir, gözlənilən nəticəni müstəqil şəkildə nəticə çıxararaq özləri əldə edirlər. Bu metod nəticəsində avadanlıqla işləmə bacarıqları qazanılır. Praktik iş metodu kimi laborator işləri yalnız fərdi olaraq deyil, həm də cüt və qrup şəklində də aparmaq olar.

**Oyun metodu**, sağlamlıq imkanları məhdud uşaqların inkişafında mühüm rol oynayan şagirdlərin sosial və psixoloji hazırlığını təmin edən diaqnos edici, proqnosverici və korreksiyaeldici vasitəsidir. Metod interaktivdir, burada öyrədiici qarşılıqlı təsir nəinki təkcə müəllim-şagird birgə fəaliyyəti nəticəsində deyil, ən əsası-oyunun məzmunu təşkil edən şagird-şagird formasında həyata keçirilir. Bu metod düşünmə qabiliyyətlərini inkişaf etdirir, işgüzar nitq bacarıqlarını formalaşdırır, bütün şagirdlərin, xüsusən də SİM uşaqların sosial adaptasiyasına kömək edir.

**Layihələr metodu** aşağıdakı kimi xarakterizə edilə bilər: şəxsiyyətyönümlü, fəaliyyətə əsaslanan, problemli öyrənmə prinsipləri üzərində qurulmuş, qrupda qarşılıqlı əlaqəni öyrətmək, beləliklə sosial səriştəni formalaşdırmaq, işgüzar münasibətə yaradıcı münasibət inkişaf etdirmək, sağlamlığı qorumaq. Layihələr metodunun texnologiyası uşaq şəxsiyyətinin emosional-iradi sferasını korreksiya edir: aqressiv-müdafiə reaksiyalarını azaldır, həyəcanlılığı və qorxaqlığı aradan qaldırır, ünsiyyət bacarıqlarını inkişaf etdirir və adekvat özünəqiymət formalaşdırır.

**İnformasiya-kommunikasiya texnologiyaları** inklüziv təhsildə xüsusi rol oynayır. Müasir kommunikasiya vasitələri təkcə SİM insanların sosial inteqrasiyası üçün vacib bir vasitə deyil, həm də bilik və informasiyalara sərbəst girişə əsaslanan fərdin potensialını əhəmiyyətli dərəcədə artıran inkişaf etməkdə olan təhsil mənbəyidir. Müəllimlər kompensasiyaedici köməkçi texnologiyadan və didaktik köməkçi texnologiyadan istifadə edirlər. Kompensasiya texnologiyası ənənəvi təhsil fəaliyyətlərini (oxu və yazını) asanlaşdırmaq üçün texniki yardım göstərir.

Didaktik texnologiya uyğun təlim mühiti və təhsil mənbələri yaratmaq üçün İKT-nin istifadəsində pedaqoji yardım göstərir. Düzgün seçilmiş köməkçi texnologiyalardan (texniki cihazlar, uyğun proqram təminatı və uyğun təhsil metodikası) istifadə etməklə, dayaq-hərəkət sistemi pozulmaları olan qələm tuta bilməyən uşaqlar belə rəsm çəkə və yaza bilirlər. Eynilə eşitmək iqtidarında olmayan uşaqlar kompüter və ya planşetdən istifadə edərək şifahi ünsiyyət qura bilirlər.

**Tapşırıqları yerinə yetirərkən siqnal kartlarından** *(onların üzərində bir tərəfdə müsbət, digər tərəfdə isə-mənfi təsvir olunmuşdur; səslərə görə müxtəlif rəngli dairələr,hərflərlə kartlar)* **istifadə**. Uşaqlar tapşırığı yerinə yetirirlər, ya da ki, onun düzgünlüyünü qiymətləndirirlər. Kartlar şagirdlərin biliklərini yoxlamaq, keçilən materialdakı boşluqları müəyyənləşdirmək məqsədi ilə istənilən mövzunun öyrənilməsində istifadə edilə bilər. Onlaın rahat və səmərəli olaması, hər bir uşağın əməyinin dərhal görünməsində özünü biruzə verir.

Tapşırıq yerinə yetirərkən, krossvord həll edərkən və s. **hallarda lövhədəki qoyulan əlavələrdən** *(hərf və söz)* **istifadə metodu,** Uşaqlar bu tip tapşırıqların icrası zamanı yarış (rəqabət) anını çox xoşlayırlar, çünki o kartlarını lövhəyə yapışdırmaq üçün sualı düzgün cavablandırmalı və ya təklif olunan tapşırığı hamıdan yaxşı yerinə yetirməlidir.

**Yaddaş üçün düyünlər** *(Yadda saxlanılması lazım olan mövzunun öyrənilməsində əsas məqamların, nəticələrin tərtib edilməsi, yazılması və lövhədən asılması)* **metodu**. Bu metoddan mövzunu öyrənilməsinin sonunda möhkəmləndirmə, ümumiləşdirmə zamanı, eləcə də, tapşırıqları yerinə yetirməyə kömək etmək üçün istifadə edilə bilər.

Dərsin müəyyən bir mərhələsində **materialın qapalı gözlərlə qavranılması** üçün eşitmə qavrayışını, diqqətini və hafizəsini inkişaf etdirmək; dərs zamanı uşaqların emosional vəziyyətinin dəyişdirilməsi; uşaqları aktiv fəaliyyətdən sonra (bədən tərbiyəsi dərsindən sonra), çətinliyi getdikcə artan tapşırığı yerinə yetirdikdən sonra dərslərə getməyə sövq etmək üçün istifadə olunur.

Müəllimlər öz praktik fəaliyyətlərində həm sinif, həm də sinifdənkənar işlərdə **sağlamlıq qoruyucu texnologiyala**rdan istifadə edirlər. Bu təmrinlərin vasitəsi ilə, uşaqlarda psixo-emosional və fiziki stresin qarşısının alınması və korreksiyası üsullarından istifadə etməklə şagirdlərin psixi sağlamlığının möhkəmlənməsini təmin edirlər: gərgin intellektual fəaliyyət zamanı, əsəb gərginliyinin aradan qaldırılması üçün, duruşun korrektə edilməsi üçün.

**Dərs zamanı təqdimat və təqdimat fraqmentlərindən istifadə**. Müasir kompüter texnologiyalarının məktəb praktikasına tətbiqi müəllimin işini daha məhsuldar və səmərəli edir. İKT-nin tətbiqi ənənəvi iş formalarını üzvi şəkildə tamamlayır, müəllimin təhsil prosesinin digər iştirakçıları ilə qarşılıqlı əlaqəsini təşkil etmək imkanlarını genişləndirir. Təqdimat proqramından istifadə etmək çox rahatdır. Slaydlarda lazımlı şəkil materialını, rəqəmsal fotoşəkilləri, mətnləri yerləşdirə bilərsiniz; təqdimatınıza musiqi və səs əlavə edə bilərsiniz. Materialın belə bir təşkili ilə üç növ uşaq yaddaşı daxildir: vizual, eşitmə və motor. Bu, mərkəzi sinir sisteminin sabit vizual-kinestetik və görmə-eşitmə şərtli refleks əlaqələrinin yaranmasına imkan verir. Korreksiya işi müddətində, onların əsasında uşaqlar düzgün danışıq bacarıqları formalaşdırır və gələcəkdə danışıqlarına nəzarət edə bilərlər. Multimediya təqdimatları dərsə əyaniliyin səmərəsinə təsir göstərir, motivasiya fəaliyyətini artırır və müəllim-loqoped ilə uşaq arasında daha sıx əlaqəyə kömək edir. Ekranda şəkillərin ardıcıl görünməsi sayəsində uşaqlar tapşırıqları daha diqqətlə və tam yerinə yetirmək imkanına sahib olurlar. Animasiya və sürprizlərin anlarından istifadə korreksiya prosesini maraqlı və ifadəli edir. Uşaqlar yalnız loqopeddən deyil, səs dizaynı ilə müşaiyət olunan şəkillər-mükafatlar şəklində kompüterdən də təsdiq alırlar.

**Aktiv refleksiya metod**ları. Refleksiya ümumiyyətlə fəaliyyətin və nəticələrinin özünütəhlili kimi başa düşülür:

1) əhval-ruhiyyənin və emosional vəziyyətin əks olunması;

2) tədris materialının məzmununun əks olunması (ondan şagirdlərin keçilmiş materialın məzmununu necə dərk edildiyini öyrənmək üçün istifadə edilə bilər);

3) fəaliyyətin refleksiyası (şagird yalnız materialın məzmununu dərk etməməli, həm də işinin yollarını və üsullarını dərk etməli, ən rasional olanları seçməyi bacarmalıdır).

Sinifdə SİM uşaqlar ilə işləyərkən ən çox əhval-ruhiyyə və emosional vəziyyətin refleksiyasında müxtəlif rəngli şəkillər təsvir olunmuş üsullardan istifadə olunur. Uşaqlar öz əhvallarına uyğun kart göstərirlər.

Məzmun, uşaqların əqli və intellektual imkanlarına və onların ehtiyaclarına cavab verərsə, təhsil fəaliyyətini artırmaq üçün təsirli vasitə olur. Fəal təlim metod və üsullarından istifadə şagirdlərin idraki fəaliyyətini artırır, yaradıcılıq qabiliyyətlərini inkişaf etdirir, şagirdləri təlim prosesinə fəal cəlb edir, SİM uşaqların müstəqil fəaliyyətini stimullaşdırır.

Yuxarıda göstərilənlərə əsasən, cəmiyyətin sosial sifarişini nəzərə alaraq, inklüziv təhsildə sağlamlıq imkanları məhdud uşaqlar ilə işləməkdə informasiya və kommunikasiya texnologiyalarından ibarət aktiv təlim metodları texnologiyasından istifadə etmək mümkün olduğu qənaətinə gəlmək olar. Eyni zamanda, müəllim SİM uşaqlarda inkişaf yayınmalarını nəzərə alaraq şagirdlərin tədris fənnindən, yaşından, fərdi xüsusiyyətlərindən asılı olaraq aktiv təlim metodlarını seçməyi öyrənməli, tədris materialının məzmununa, dərsin məqsədinə uyğunlaşdırmalı, öz peşəkar səviyyəsini nəzərə almalı, valideynlərlə qarşılıqlı əlaqədə olmalı və dəstək xidməti mütəxəssisləri ilə görüşməlidir. SİM uşaq müəyyən fənlər üzrə təlimdə yaxşı nəticələr göstərə bildiyindən, inklüziv təhsildə aktiv təlim metodlarından istifadənin vacibliyini vurğulamaq lazımdır; SİM uşaqın sosial səriştəsi yaxşılaşdırır,özünəqiymət yüksəlir və idrak fəaliyyəti üçün motivasiya artır.

## Ədəbiyyat

1. «Активные методы обучения». Электронный курс. Международный Институт Развития «ЭкоПро», Образовательный портал «Мой университет»,http://www.moi-universitet.ru
2. Обучение детей с нарушениями интеллектуального развития / Под ред. Б.П.Пузанова. М., 2007.
3. Специальная педагогика: в 3 т./ Под ред. Н.М.Назаровой. М., 2008.
4. Хижнякова О.Н. Современные образовательные технологии в начальной школе. – С. 2006

**Rəyçi: dos. T.Ağayeva**

Göndərilib: 10.02.2021 Qəbul edilib: 14.02.2021

DOI: 10.36719/2663-4619/63/37-42

**Gülnaz Rəfail qızı Ələsgərova**
Bakı Dövlət Universiteti
hüquq üzrə fəlsəfə doktoru, dosent
alasgarova.gulnaz@gmail.com

# NİFRƏT NİTQİNİN ANLAYIŞI-AVROPA ŞURASI VƏ AVROPA İNSAN HÜQUQLARI MƏHKƏMƏSİNİN YANAŞMALARININ MÜQAYİSƏLİ TƏHLİLİ

***Açar sözlər:*** *söz azadlığı, nifrət nitqi, Avropa Şurasının standartları, Avropa İnsan Hüquqları Məhkəməsi, ifadənin məzmunu, zorakılığa çağırış*

## The concept of hate speech - a comparative analysis of the approaches of the Council of Europe and the European Court of Human Rights

**Summary**

Providing an opportunity for society to develop and progress, freedom of speech is surely one of the vital conditions for sustainable democracy. Nevertheless, freedom of speech is not an absolute right and exhaustive list of limitations are delineated by many jurisdictions. In Europe as well it is still subject to accepted restrictions designed to prohibit incitement to hatred or conflict with other human rights. This article discusses approaches to hate speech as a legitimate ground for restriction of freedom of speech. The article is dedicated to a comparative analysis of the case law of the ECHR and the provisions of the Recommendations adopted in the framework of the Council of Europe. In particular, the author tries to find a clear distinction between speech that is not welcome by the majority of society and the prohibition of hate speech.

***Key words:*** *freedom of speech, hate speech, standards of Council of Europe, European Court on Human Rights, context of speech, call for violence*

## Giriş

İfadə azadlığı dayanıqlı demokratiyanın təməl sütunlarından və şərtlərindən biri olaraq digər hüquq və azadlıqların müdafiəsini və tətbiqini gücləndirir, habelə cəmiyyətin fasiləsiz və davamlı inkişafı üçün möhkəm zəmin yaradır. Avropa Şurası Dövlət və Hökumət Başçıları Üçüncü Zirvə Toplantısında "ifadə və məlumat azadlığının, habelə kütləvi informasiya vasitələrinin müstəqilliyinin demokratiyamızın mühüm elementləri kimi təşviq etmək və onlara zəmanət vermək öhdəliklərini" bir daha təsdiq etdilər. (Action Plan, CoE CM (2005)).

Bununla belə, ifadə azadlığı mütləq hüquq deyil və digər insan hüquqları ilə təzad, ziddiyyət təşkil edən və ya hər-hansı topluma və ya şəxsə qarşı nifrət təbliğ edən çıxışların qarşısının alınması üçün dövlətlər tərəfindən qəbul edilmiş bəzi qanuni məhdudiyyətlərə məruz qala bilər. Fəqət, həm ifadə azadlığı, həm də şəxslərin şərəf və ləyaqətinə hörmət hüququ dayanıqlı demokratiyaların təməl sütunlarından olaraq dövlət tərəfindən eyni dərəcədə müdafiə olunmalıdırlar. Bu səbəbdən də ifadə azadlığı ilə şərəf və ləyaqətə hörmət hüququ cəmiyyət tərəfindən bir-birilərini istisna edən deyil, bir-birilərini tamamlayan hüquqlar kimi qəbul olunmalıdırlar. Nifrət nitqi bu nöqteyi-nəzərdən istisnanı təşkil edir, çünki o, demokratik cəmiyyətlərdə ictimai debatlar üçün həqiqi təhdid mənbəyi kimi qiymətləndirilir.

İfadə azadlığı təkcə təhqiramiz və ya laqeydlik halı kimi qəbul edilən və ya hesab edilən "informasiya" və ya "ideyalara" deyil, həm də dövləti və ya cəmiyyətin hər hansı təbəqəsini təhqir edən, şoka salan və ya narahat edən informasiya və ideyalara şamil edilir (Handyside v. the United Kingdom, EctHR, 1976: § 49). Digər tərəfdən, tolerantlıq və hər kəsin bərabər şəkildə ləyaqətinə hörmət etmək demokratik, plüralist bir cəmiyyətin əsasını təşkil edir. Belə olduğu təqdirdə demokratik ənənələrə sahib bir çox cəmiyyətlərdə tətbiq olunan "rəsmiyyətlər", "şərtlər" "məhdudiyyətlər" və ya "cərimələr" ilə mütənasib olduğu təqdirdə, dözümsüzlüyə əsaslanan nifrəti təbliğ, təhrik və ya təşviq edən və ya ona əsaslanan bütün ifadə formalarının qarşısını almaq və ya belə nitqə görə müvafiq sanksiya tətbiq etmək kimi qanuni hədəflər müəyyən oluna bilər (Erbakan v. Turkey, 2006: §56). Buna baxmayaraq, qanuni məqsədlərə cavab vermək üçün məhdudiyyətlər olduqca müəyyən və məhdud olmalıdır.

Bildiyimiz kimi ifadə azadlığının məhdudlaşdırılması üçün fərqli əsaslar mövcuddur, lakin mövzu geniş olduğundan hazırki məqalə sırf nifrət nitqi ilə bağlı yanaşmanın təhlilinə həsr olunacaqdır.

Bu mövzunu maraqlı edən xüsusiyyətlərdən biri məcburi hüquqi qüvvəyə malik beynəlxalq sənədlərdə nifrət nitqinə hamılıqla tanınmış anlayışın verilməməsidir. Belə olduğu halda nifrət nitqinin qarşısının

alınması səbəbilə ifadə azadlığının məhdudlaşdırılması sahəsində qeyri-müəyyənliklə, o da öz növbəsində ifadə azadlığının mütənasib olmayan şəkildə məhdudlaşdırılması ilə nəticələnəcəkdir. Azərbaycan Avropa Şurasının üzvü olduğundan bu qurumun və Avropa İnsan Hüquqları Məhkəməsinin (AİHM) yanaşmasını təhlil etmək və öyrənmək bizim üçün olduqca vacibdir.

Məqalədə həm Avropa Şurasının Parlament Assambleyası tərəfindən qəbul edilmiş tövsiyələr, həmin qurumun problemə yanaşması, digər tərəfdən isə AİHM-in presedent hüququndan hasil olunan nəticələr qarşılıqlı və müqayisəli şəkildə təhlil olunacaqdır. AİHM-in Avropa Şurası çərçivəsində qəbul edilən Avropa İnsan Hüquqları Konvensiyası əsasında fəaliyyət göstərməsinə baxmayaraq nifrət nitqinin anlayışına və açıqlamaları, ifadələri nifrət nitqi kimi səciyyələndirmək məqsədilə istifadə olunan kriteriyalar müəyyən olunacaq və hər iki yanaşmanın müsbət və mənfi tərəfləri nəzərdən keçiriləcək.

Nifrət nitqi konsepsiyasını təyin etmək üçün dəqiq bir yanaşma və ya hüquqi meyar seçmək çətindir, çünki biz yalnız hamılıqla qəbul oluna biləcək meyarı müəyyən etməməliyik, həm də nifrət nitqinə mütənasib məhdudiyyətlərin çərçivəsini təyin etməliyik. “Nifrət” – şifahi davranış və digər simvolik, kommunikativ hərəkətlərə istinad etmək üçün istifadə olunan hüquqi və siyasi nəzəriyyədə bir sənət terminidir (Corlett, Francescotti, 2002: 1083). Nifrət bir qayda olaraq etnik mənsubiyyəti, dini, cinsi ilə fərqlənən qrupları tərənnüm edən və onlara mənsub olan toplumlara və ya bir şəxsə qarşı qəsdən güclü antipatiyanı ifadə edir (Simpson, 2013: 701). Nifrətə təhrik təhqir, təqib, dözümsüzlüyə əsaslanan nifrəti yayan, təhrik edən, təşviq edən və ya əsaslandıran bütün ifadə formalarını əhatə edir. Bu, gələcəkdə müəyyən bir qrupa qarşı daha çox təzyiq və ayrı-seçkiliyin tətbiqi üçün əsas rolunu oynaya bilər. Bu səbəbdən nifrət nitqi ilə ifadə azadlığı arasında sərhəd müəyyən etmək vacibdir, çünki ifadə azadlığı “dövləti və ya əhalinin hər hansı bir hissəsini incidən, sarsıdan və ya narahat edən” ifadələri də ehtiva edə bilər (Erbakan v. Turkey, 2006: §49).

Bəzi elm adamlarının fikrincə, “nifrət nitqi” məhfumu ilk olaraq Amerika Birləşmiş Ştatlarında istifadə olunmuşdur və daha sonra hüquq elmində digər ölkələrin nümayəndələri tərəfindən istinad olunaraq məşhurluq qazandı (Belavusau, 2013: 40). Nifrət, fərdin təmsil etdiyi qrup ilə fərdi birləşdirən xüsusiyyətlərə aiddir. Cəmiyyətdəki müəyyən bir qrupu stereotipləşdirmək şəxsin qabiliyyət və ehtiyaclarını fərdi qaydada müəyyən etməyə və qiymətləndirməyə maneələr törədir (Carvalho Pinto de Sousa Morais v. Portugal, 2017: §46).

Avropa İnsan Hüquqları Məhkəməsinin nifrət nitqinin çərçivələrinin müəyyən edilməsi ilə bağlı fəaliyyətindən söz açarkən bildirmək lazımdır ki, AİHM dərc etdiyi qərarlarda konkret olaraq nifrət nitqini təşkil edən müəyyən ifadələr və dözümsüzlük əsasında nifrətə təhrik və təşviq edən çıxışlar arasında fərq qoymamışdır (Rainey, Wicks, Ovey, 2014: 441).

AİHM bir çox hallarda Avropa İnsan Hüquqları Konvensiyasının 17-ci maddəsinə və 10.2-ci maddəsində göstərilən məhdudiyyətlərə istinad edirdi (Rainey, Wicks, Ovey, 2014: 441). Konvensiyada heç nə hər hansı dövlətin, qrupun və ya şəxsin burada təsbit olunmuş hüquq və azadlıqlarının ləğvinə yönəlmiş hər hansı fəaliyyətlə məşğul olmaq və ya hər hansı əməl törətmək və ya onları Konvensiyada nəzərdə tutulandan daha artıq məhdudlaşdırmaq hüququna malik olması kimi şərh oluna bilməz. Bununla yanaşı, Məhkəmə ifadənin nifrətə təhrik olub-olmaması ilə bağlı qərar verərkən ifadənin işlədildiyi kontekstə önəm verir. Açıqlama və ya ifadə bu mövzu ilə bağlı məlumatlı tamaşaçılara, auditoriyaya münasibətdə istifadə olunması halında onun nifrətə təhrik kimi qiymətləndirilməsi ehtimalı olqudca aşağıdır (Jersild v Denmark, 1994). Beləliklə, AİHM nitqin nifrət nitqi olub-olmaması ilə bağlı yalnız qeyri-müəyyən çərçivələr müəyyən etmişdir. Bəzi hallarda isə AİHM iş materiallarında sadalanan faktların nifrət nitqi və ya nifrəti təhrik edən nitq kimi dəyərləndirib-dəyərləndirməməsi ilə bağlı məsələnin hüquqi təhlilini aparmayaraq ümumiyyətlə o məsələyə toxunmur. Vedjeland İsveçə qarşı işdə Məhkəmə məktəb şagirdləri arasında paylanılan broşurları “nifrət nitqi” mənbəyi kimi qiymətləndirərək yenə işin icraatdan çıxarılması üçün Konvensiyanın 17-ci maddəsinə istinad etdi. Öncə də qeyd edildiyi kimi nifrət nitqi nifrəti təhrik və təşviq edən ifadələri, açıqlamaları da ehtiva edir. Bu baxımdan Vedjeland işinin əhəmiyyəti danılmazdır. Digər tərəfdən bu işdə ilk dəfədir ki, AİHM nifrət nitqinin irqi əsaslı çıxışları nəzərdə tutan klassik məhfumunun çərçivəsindən kənara çıxaraq homofob ifadələri də 10-cu maddənin qanuni şəkildə məhdudlaşdırılması üçün əsas şəklində tanıdı. Məhkəmə bildirdi ki, cinsi orientasiya əsasında ayrı-seçkilik irq, milli və etnik əsaslı ayrı-seçkilik qədər ciddi problemdir (Vedjeland v Sweden, 2012: §55).

Bununla yanaşı, Məhkəmə bu işdə nifrəti təhrik etmək və bunun birbaşa və dolayı nəticələrini müəyyən edən yanaşmadan istifadə etmişdir. Məhkəmə qeyd etdi ki, nifrətə təhrik mütləq zorakılığa və ya digər cinayət əməllərinə çağırış ilə nəticələnməyə də bilər. Əhalinin müəyyən qruplarının, kəsimlərinin təhqir edilməsi, aşağılanması və ya böhtan atılması nəticəsində hücumlar ifadə azadlığından məsuliyyətsiz şəkildə istifadə edən şəxslərə qarşı mübarizənin aparılması və ifadə azadlığının məhdudlaşdırılması üçün dövlət orqanları tərəfindən müvafiq addımların atılmasına kifayət edə bilər (Vedjeland v Sweden, 2012: §55).

Bir faktı da qeyd etmək yerinə düşərdir ki, Məhkəmə nifrətə təşviqi ehtiva edən çıxışlarla bağlı tətbiq olunan məhdudiyyətlərin hüdudlarını müəyyən etməkdə dövlətlərə mülahizə sərbəstliyini tanıyır (Soulas et autres v. Fance, 2008). AİHM sırf Fransaya aid məxsusi problem olan immiqrasiya və miqrantların inteqrasiyası probleminin müzakirəsinin cəmiyyət üçün vacibliyini tanıyaraq dövlətin bu mövzu ilə əlaqədar məhdudiyyətlərin tətbiqi sahəsində mülahizə sərbəstliyini tanımışdır (Janssen, 2009: 27).

Nifrətə təhrik və ya nifrət nitqinə qarşı mübarizə sahəsində dövlətlərin mülahizə sərbəstliyinə baxmayaraq, AİHM tətbiq edilən məhdudiyyət tədbirlərinin qanuni məqsəd daşıyıb-daşımamasının müəyyən edilməsi üzrə bəzi faktorları təsbit etdi. Nifrət nitqinin məhdudlaşdırılması üçün əsasların qanuniliyini yoxlayarkən aşağıdakı faktorlara diqqət yetirmək lazımdır:

a) açıqlamalar siyasi və sosial gərginlik fonunda edilibmi (Perinçek v. Switzerland, 2015: §205);

b) birbaşa və daha geniş kontekstdə baxıldıqda, açıqlamalar zorakılığa birbaşa və ya dolayı çağırış və ya zorakılığa bəraət qazandırmaq kimi qiymətləndirilə bilərmi (Perinçek v. Switzerland, 2015: §206);

c) açıqlama və ya bəyanatın verilməsi yolu və birbaşa və ya dolayı zərərli, mənfi nəticələrə səbəb olma qabiliyyəti (Perinçek v. Switzerland, 2015: §207).

Nifrət nitqi ilə cəmiyyətin hər hansı bir hissəsini şok edən və ya təhqir edən ifadələr arasında fərq qoyarkən, ifadənin istifadəsini şərtləndirən əsasları təhlil etmək yerinə düşərdi. Cəmiyyətin bir hissəsini sarsıdan, şok edən və ya narahat edən bir açıqlama belə az və ya çox ictimai müzakirələrə öz töhfəsini verməlidir. Yalnız bu halda həmin ifadələr və çıxışlar Avropa İnsan Hüquqları Konvensiyasının 10-cu maddəsinin çətiri altında müdafiə oluna bilər. Nifrət nitqində belə açıqlamalara səbəb ictimai müzakirələrə töhfə deyil, nifrətin, dözümsüzlüyün yayılmasıdır və bu çıxışlar həqiqətlərə əsaslanan obyektiv məlumatları deyil, əsasən şəxsi fikirləri əks etdirir. AİHM tərəfindən müəyyən olunan kriteriyaların mühümlüyünə baxmayaraq, bildirmək lazımdir ki, Məhkəmənin son dərəcə kontekst, məzmuna əsaslanan yanaşması cəmiyyətin əksəriyyətinin görüşlərinə zidd olan ifadələrə, açıqlamalara qeyri-mütənasib olaraq məhdudiyyətlərin tətbiqinə gətirib çıxara bilər. Belə olduqda, sual yaranır: Kim ifadənin məzmununun Avropa İnsan Hüquqları Konvensiyasının ruhunu zidd olub-olmadığı ilə bağlı fikir yürüdə bilər? Kim öz üzərinə belə məsuliyyəti götürə bilər və götürdüyü təqdirdə obyektiv faktların təhlili zamanı həmin şəxsin subyektiv fikirlərinin digər şəxslərin fikirləri ilə kəsişdiyinə kim zəmanət verə bilər? Bildiyimiz kimi, Avropa İnsan Hüquqları Konvensiyası canlı alətdir və dəyişən cəmiyyətlərin insan hüquqlarına baxışını ehtiva edərək yeni çağırışlara cavab verir. Belə olduqda, hansısa ifadənin müəyyən zaman kəsimi daxilində Konvensiyanın ruhuna zidd olub-olmadığı ilə bağlı fikir yürütmək üçün yalnız məzmuna əsaslanan yanaşmadan istifadə Konvensiyanın tətbiqində sui-istifadələrə yol aça bilər, çünki "Konvensiyanın ruhu" konkret və aydın standartları və hüquqi çərçivələri müəyyən etməyərək Konvensiyanı tətbiq edən dövlətlərə və dövlətlərin hərəkətlərinə hüquqi qiymət verən AİHM-ə qeyri-mütənasib şəkildə qiymətləndirmə sərbəstliyi təqdim edir. Unutmaq lazım deyil ki, AİHM-in hakimləri də müəyyən dünya görüşünə, oturuşmuş əxlaqi, fəlsəfi və dini baxışlara sahib adi şəxslərdir. İşin faktiki hallarında göstərilmiş fikirlər onların nöqteyi-nəzərindən ya söz azadlığının tərənnümü kimi, ya da ki, əksinə nifrət nitqi kimi qavranıla bilər. Beləliklə, bizim fikrilərimiz və inanclarımız cəmiyyət üçün hansı ifadələrin həqiqətən də təhlükəli olmaları barədə fikir yürütmək qabiliyyətimizə təsir edə bilər (Concurring Opinion of Judge Spielmann, 2012: §1). Təbii ki, ifadə azadlığının məhdudlaşıdırılması hər bir işin faktiki hallarından asılıdır və hər bir potensial pozuntunu öncədən müəyyən etmək və presedent hüququnda pozuntuların tam siyasını müəyyən etmək qeyri-mümkündür. Lakin iş nifrət nitqinə gəldikdə, həm ifadə azadlığından istifadə edən şəxs, həm də həmin azadlığı məhdudlaşdıran dövlət orqanlarının sui-istifadələri riskini azaltmaq üçün nifrət nitqinin anlayışı verilməlidir və ya ifadənin nifrət nitqi kimi qiymətləndirilməsi üçün yalnız məzmuna əsaslanmayan tam, dolğun siyahı tərtib olunmalıdır.

Fikrimcə, "nifrət nitqi" anlayışı məcburi hüquqi qüvvəyə malik sənəddə müəyyən edilmiş standartlara cavab verməlidir və ya əsas amillər və faktorlar aydın və şəffaf şərtlərlə müəyyənləşdirilməli və "nifrət nitqi" nin tərifi auditoriyadan və digər amillərdən asılı olaraq dəyişməməlidir. Bir şəxsin ifadəsində nifrət nitqi aşkar edildikdə, o, qadağan edilməlidir, cəmiyyəti və ya onun böyük bir kəsimini şok edən digər təhqiramiz nitq formaları və açıqlamalar dövlətlərə verilən daha geniş mülahizə sərbəstliyi çərçivəsində məhdudiyyətlərə məruz qala bilər. Əks təqdirdə nifrət nitqi ilə mübarizə çoxluğun paylaşdığı fikirlərə əks gedən və ya onlarla razılaşmayan şəxslərə qarşı təqbi vasitəsinə çevrilə bilər. AİHM-in yanaşması ilə əlaqədar son olaraq qeyd etmək lazımdır ki, Məhkəmə nifrət nitqinə konkret anlayış verməsə də, nifrət nitqini müəyyənləşdirmək üçün bir çərçivə hazırlamışdır. Bununla birlikdə, kifayət qədər çox sayda işlərdə Məhkəmə, müəyyən bir ifadənin nifrət nitqini təşkil etməsi ilə bağlı suaal konkret cavab verməyərək avtomatik olaraq həmin ifadələrin Konvensiyanın ruhuna zidd olduğunu bildirərək 17-ci maddə altında işi qəbuledilməz elan etmişdir ki, bu da öz növbəsində nifrət nitqi ilə bağlı Məhkəmənin yanaşmasını

öyrənməyə maneə törətmişdir. AİHM daha çox bu sahədə dövlətlərə mülahizə sərbəstliyi tanıyaraq konkret ifadələrin nifrət nitqi olmasını müəyyən etməyi dövlətlərin səlahiyyət çərivəsinə aid etmişdir.

AİHM-in presedent hüququ ilə yanaşı, Avropa Şurası nifrət nitqi ilə mübarizə sahəsində kifayət qədər geniş "yumşaq hüquq" normaları hazırlamışdır. Bildiyimiz kimi, Avropa Şurası Nazirlər Komitəsinin 97/204 saylı Tövsiyəsi məcburi hüquqi qüvvəyə malik olmasa da, təşkilat çərçivəsində ilk dəfə nifrət nitqinin anlayışını vermişdir. Tövsiyədə verilən anlayışa görə "nifrətə təhrik" dedikdə irqi nifrəti, ksenofobiyanı, antisemitizmi və ya dözümsüzlüyə əsaslanan digər nifrət formalarını yayan, təhrik edən, təşviq edən və ya əsaslandıran bütün ifadə formalarını əhatə etməsi başa düşülməlidir, bunlara aiddir: aqressiv millətçilik və etnosentrizm, ayrıseçkiliklə ifadə olunan dözümsüzlük, azlıqlara, miqrantlara və immiqrant mənşəli insanlara qarşı düşmənçilik.

Bu tövsiyə vasitəsilə Nazirlər Komitəsi üzv dövlətləri nifrətə çağırış və ya irqi zəmində nifrət, ksenofobiya, antisemitizm və ayrı-seçkiliyin digər formaları, habelə dözümsüzlüyə əsaslanan nifrət nitqi kimi tövsif oluna bilən açıqlamalarla və ifadələrlə mübarizəyə çağıraraq nifrət nitqinin qarşısının alınması üçün məhdudiyyətlərin sahəsini genişləndirməyə təşviq edir (Heinze, 2006: 545).

Qeyd etmək yerinə düşərdi ki, Avropa Şurası çərçivəsində sırf irqi zəmin ayrı-seçkilik və nifrət nitqi ilə mübarizə sahəsində bir sıra tövsiyələr və digər hüquqi sənədlər toplusu hazırlanmışdır. Müqayisə üçün bildirmək lazımdir ki, seksist nifrət nitqi üzrə yanaşma son zamanlar işlənməyə başlanıldığından bu sahədə hüquqi sənədlər bir o qədər deyil.

Lakin Avropa Şurası çərçivəsində fəaliyyət göstərən 15 saylı Ümumi Siyasət Tövsiyəsində digər yanaşma tətbiq olunaraq nifrət nitqinin daha geniş anlayışından istifadə olunur. İlk dəfə digər əsaslarla birgə cins də nifrət nitqi üçün əsaslardan biri kimi müəyyən edildi. Bu Tövsiyəyə görə nifrət nitqi aşağıdakı kimi başa düşülməlidir: şəxsin və ya bir qrup şəxsin alçaldılmasına, təhqir edilməsinə, ona qarşı düşmənçiliyə təhrik və ya təşviq etmə, habelə bu cür şəxsə və ya şəxslərə qarşı irq, din, dil, inanc, vətəndaşlıq, milliyyət və ya etnik məsubiyyət, həmçinin yaş, cins, cinsi mənsubiyyət və cinsi orientasiya da daxil olmaqla şəxsi xüsusiyyətlərin natamam siyahısına əsaslanan qısnama, təhqir, neqativ stereotiplərin yaradılması, damğalama və ya təhdidlər və ya yuxarıda sadalanan hərəkətlərə bəraət qazandırma (Explanatory Memorandum to the Rec. ECRI,2015: § 9). Hazırki Tövsiyədə istifadə olunan nifrət nitqinin anlayışı digər sənədlərdəki təriflərdən olduqca genişdir və AİHM tətbiq etdiyi yanaşma ilə tam kəsişmir. Tövsiyə həm artıq var olan standartları, həm də nifrət nitqini müəyyən etməyə imkan yaradan yeni yanaşmaları ehtiva edir. Tövsiyə dövlətlər qarşısında hüquqi öhdəliklər nəzərdə tutmasa da, gender bərabərliyi sahəsində damğalama, stereotiplərin qadağan olunması kimi aspektləri də nifərt nitqi anlayışına daxil etmək üzrə niyyətini ortaya qoyur. Ayrı-seçkiliklə bərabər nifrət nitqinin əhatə dairəsi də genişlənməyə məruz qalmışdır. AİHM-nin nifrət nitqinə zorakılığın və ya digər zərərli nəticələrə səbəb olan ifadələrin birbaşa və dolayı təşviqi kimi yanaşmasından fərqli olaraq, hazırkiTövsiyə nifrət nitqinə böhtan və təhqirlərin yayılması və təşviqini də daxil edərək daha da irəli gedir. Bu yanaşma nifrət nitqinin anlayışını genişləndirir və nəticədə ifadə azadlığının dövlətlər tərəfindən ixtiyari olaraq məhdudlaşdırmasına gətirib çıxara bilər, çünki mənfi stereotipin tətbiqi və damğalamanın anlayışı ayrıca verilmədən onların nifrət nitqi məhfumuna daxil edilməsi hüquqi qeyri-müəyyənliyi daha da qabarıq biruzə verəcək. Tövsiyədə göstərilən aşağıdakı aspektlər AİHM-in yanaşmasında nəzərdə tutulmadığından onlara fikir yetirmək məqsədəmüvafiqdir:

(a) bəhs edilən nifrət nitqinin istifadə olunduğu kontekst (xüsusən, nifrət nitqinin əlaqələndirildiyi cəmiyyətdə onsuz da ciddi gərginliyin olub-olmaması);

(b) nifrət nitqindən istifadə edən bir insanın başqalarına təsir etmə qabiliyyəti (məsələn, bu şəxslərin siyasi, dini və ya ictimai xadim olması);

(c) istifadə olunan dilin təbiəti və gücü (məsələn, təhrikedici və birbaşa olaraq auditoriyaya istiqamətlənmişdirmi, yalnış məlumatlar, mənfi stereotip və damğalanma və ya zorakılıq, hədə-qorxu, düşmənçilik və ya ayrı-seçkilik hərəkətlərini təşviq edə bilən dildirmi);

(d) konkret şərhlərin məzmunu (istər təcrid olunmuş yeganə hadisə olsun, istərsə dəfələrlə təkrarlanmış ifadələrə yer versin və xüsusən debatlar zamanı eyni və ya başqa bir şəxsin fərqli ifadələr ilə tarazlı və mütənasib hesab edilə bilərmi);

(e) istifadə olunan ortam və ya şərait (məsələn, interaktiv bir tədbirdə dərhal bir tamaşaçı reaksiyasının mümkün olub-olmaması);

(f) tamaşaçı auditoriyasının keyfiyyəti (şiddət, zorakılıq, hədə-qorxu, düşmənçilik və ya ayrı-seçkilik hərəkətlərinə meyl varmı) (Explanatory Memorandum to the Rec. ECRI, 2015: §16).

Tövsiyədəki yanaşma AİHM-in tətbiq etdiyi yanaşma ilə oxşarlıq təşkil edir. Sadəcə olaraq Tövsiyə nifrət nitqini daha geniş tövsif edərək nifrətə təhrikə niyyətin olmasını müəyyən etmək sahəsində dövlətlərə

olduqca geniş mülahizə sərbəstliyini tanıyır. Tövsiyədə nifrət nitqinin anlayışı ilə birlikdə, çıxış və ya açıqlamanın nifrət nitqi sayılması üçün kriteriyaların siyahısı sadalanır.

Nəticədə qeyd etmək olar ki, AİHM-in nifrət nitqinə yanaşması Ümumi Siyasət Tövsiyəsi N. 15 ilə müqayisədə daha konkret və aydındır. Belə ki, Tövsiyə mənfi stereotipləri, təbliğatı, nifrətə təhriki və s.-ni ehtiva edir. Beləliklə, ifadə azadlığına qeyri-mütənasib şəkildə təzyiq göstərən, digər tərəfdən isə, böhtan, qaralama, nifrətə təhrik edən hüquqi mətnlərdəki qeyri-müəyyən ifadələrin tətbiqindən uzaqlaşmaq üçün hüquq ictimaiyyəti nifrət nitqi ilə mübarizə sahəsində birgə səyləri ortaya qoyaraq vahid yanaşma sərgiləməlidir.

## Nəticə

Yuxarıda aparılan müqayisəli təhlilə nəticə olaraq qeyd etmək lazımdır ki, həm AİHM-in, həm də Avropa Şurasının yanaşması nifrət nitqinin anlayışının hüquq müstəvisində bərqərar olması üçün mühüm əhəmiyyət kəsb edir. Bununla belə hər iki yanaşmadakı çatışmazlıqlara toxunmadan onların tətbiqindəki boşluqları aradan qaldırmaq çətin olacaqdır.

Məqalədə aparılan təhlili bir daha detallı təsvir etmədən bəzi aspektləri qeyd etmək məqsədəmüvafiqdir. İlk növbədə AİHM-in yanaşmasını araşdıraraq müsbət tərəflərlə yanaşı bəzi boşluqları görmək mümkündür. Birincisi, AİHM ifadə azadlığını ehtiva edən Avropa İnsan Hüquqları Konvensiyasının 10-cu maddəsinin pozuntusu iddia edilən işlərdə bir çox hallarda mübahisələndirilən ifadənin, çıxışın, açıqlamanın və ya özünüifadənin hər hansı digər formasının nifrət nitqi və ya nifrətə təhrik edən nitq kimi qiymətləndirməsi məsələsini qaldırmayaraq birbaşa olaraq onun Konvensiyanın ruhhunza zidd hərəkət kimi 17-ci maddə çərçivəsində işi qəbuledilməz elan edir. Belə olduğu halda, konkret olaraq həmin ifadənin hansı hissəsinin 10-cu maddənin sui-istifadəsi olduğu ilə bağlı məsələ qaranlıq qalır. Belə olduğu təqdirdə, nifrət nitqi anlayışı hüquqi müstəvidə inkişaf etdirilmir və nəticədə nifrət nitqinin müəyyən edilməsi üzrə vəzifə mülahizə sərbəstliyi çərçivəsində üzv dövlətlərə həvalə edilir.

İkincisi, nifrət nitqinin işin faktiki hallarından asılı olaraq müəyyən edilməsində AİHM məzmuna, kontekstdə əsaslanmış yanaşmadan istifadə edir ki, bu da məsələnin həllində hüquqi müəyyənlik prinsipinə uyğunluğu tam təmin etmir.

AİHM ilə müqayisədə Avropa Şurasının qurumları yeni yanaşma təklif edərək artıq oturuşmuş nifrət nitqi məhfumunu daha da genişləndirərək buraya damğalama, aşağılama, mənfi stereotiplərdən istifadə kimi yeni anlayışları əlavə edərək dövlətlərin nifrət nitqi ilə mübarizə sahəsini daha da genişləndirmişdirlər. Avropa Şurası bir çox hallarda irqi ayrı-seçkilik səbəbilə tətbiq edilən nifrət nitqi ilə mübarizə sahəsində tövsiyələr və digər hüquqi sənədlər hazırlamışdır. Lakin qadınlara qarşı istifadə olunan seksist nifrət nitqi ilə mübarizə sahəsində tövsiyələr və digər sənədlər yalnız son zamanlarda qəbul edilməyə başladı. Avropa Şurasının nifrət nitqi sahəsində qəbul etdiyi çoxsaylı sənədlərdən mühüm əhəmiyyət kəsb edənləri R (97) saylı Tövsiyə və 15 saylı Ümumi Siyasət Tövsiyəsidir. Belə ki, hər iki sənəddə nifrətə təhrik və nifrət nitqinin əhatə dairəsi və ifadənin nifrət nitqi kimi tövsif olunması üçün kriteriyalar təsbit edilmişdir. Həmin kriteriyalar AİHM-in müəyyən etdiklərindən daha genişdir.

Hər iki qurumun istifadə etdiyi yanaşmalardakı fərqlərə baxmayaraq, onların oxşar tərəfləri də vardır. Belə ki, yanaşmalar məzmun (kontekst) xarakterlidir. Yəni ifadənin nifrət nitqi kimi qiymətləndirilməsi üçün onun obyektiv xassələri və xüsusiyyətləri deyil, ifadənin edildiyi kontekst, mühit əsas götürülür ki, bu da ifadə azadlığının məhdudlaşdırılması üçün vacib əsaslardan olan nifrət nitqinin müəyyən edilməsində boşluqlar yaradır. Belə olduqda, ölkədən ölkəyə nifrət nitqinin anlayışı daralıb genişlənə bilər ki, XXI yüzillikdə informasiyanın ötürülməsində dövlət sərhədləri mühüm rol oynamadığından bir ölkədə nifrət nitqi kimi tanınmayan məlumat digər ölkənin yurisdiksiyası çərçivəsində yayıldıqda müvafiq qanunvericilik çərçivəsində məsuliyyətə səbəb ola bilər.

Yuxarıda qeyd olunanları cəmləşdirərək belə nəticəyə gəlmək olar ki, nifrət nitqi ilə mübarizənin effektivliyinin artırılması üçün onun Avropa regionunda vahid anlayışı olmalıdır və hal- hazırda tətbiq edilən kontekst-əsaslı yanaşmadan uzaqlaşmaq lazımdır.

## Ədəbiyyat

1. Action Plan, CM (2005) 80 final 17 May 2005 [elektron mənbə] URL: http://coe.int/t/dcr/summit/ 2005 0517_plan_action_en.asp. (son baxış - 02.02. 2021)
2. Handyside v. the United Kingdom judgment of 7 December 1976
3. Erbakan v. Turkey judgment of 6 July 2006
4. Corlett J.A., Francescotti R., Foundations of a Theory of Hate Speech // Law Review 2002. № 48
5. Simpson R.M., Dignity, Harm, and Hate Speech // Law and Philosophy 2013. № 32

6. Belavusau U. Freedom of Speech: Importing European and US Constitutional Models in Transmational Democracies / London α New York: Routledge, Taylor α Francis Group, 2013. -220 c.
7. Carvalho Pinto de Sousa Morais v. Portugal, app. no. 17484/15, 25/07/2017
8. Rainey B., Wicks E., Ovey C. The European Convention on Human Rights/6 Oxford: Oxford Uni Press, 2014. – 652 p.
9. Jersild v Denmark, (App. 15890/89), September 24, 1994, Series A No. 298, (1994) 19 EHRR1
10. Vedjeland v Sweden, (App.1813/07), 9 February 2012
11. Case of Soulas et autres v. Fance (Requête no 15948/03), 10 July 2008
12. Janssen E. Limits to Expression on Religion in France // Agam & Religiustas di Europa, Journal of European Studies 2009. № 1. – pp. 22-45.
13. Case of Perinçek v. Switzerland, (Application no. 27510/08), 15 October 2015
14. Concurring Opinion of Judge Spielmann Joined by Judge Nussberger, Vejdeland and others v. Sweden Judgment , (App.1813/07), 9 February 2012 – Separate Opinions
15. Recommendation No R (97) 20E (1997) [elektron mənbə] URL: https://search.coe.int/cm/Pages/result_details.aspx?ObjectID=0900001680505d5b (son baxış - 08.02. 2021)
16. Heinze E. Viewpoint Absolutism and Hate Speech// The Modern Law Review-2006. T. 69. № 4. – C. 543-582.
17. Explanatory Memorandum to ECRI General Policy Recommendation No. 15 on Combating Hate Speech, 2015. 20. Explanatory Memorandum to the Rec. ECRI 2015

**Rəyçi: prof. Ş.Səmədova**

Göndərilib: 11.02.2021 Qəbul edilib: 14.02.2021

DOI: 10.36719/2663-4619/63/43-45

**Аркиназ Гамидулла гызы Магомедгасан заде**
Бакинский славянский университет
старший преподаватель
arkinaz.mammadhasanzade@gmail.com

# ХУДОЖЕСТВЕННАЯ ЛИТЕРАТУРА В ОБУЧЕНИИ РКИ

***Ключевые слова**: РКИ, методика обучения, работа над текстом, студент-иностранец, художественный текст*

**Working on text as a key point in learning RFL**
**Summary**
Reading is an important type of speech activity that needs to be taught to foreigners at the initial stage of learning the Russian language. The use of literary texts in the process of teaching Russian to foreigners has a multifaceted nature. At the same time, the literary text acts as a source of linguistic knowledge and material for improving receptive skills in reading as a type of speech activity. Fiction is widely used in the disclosure of regional problems, aiming students at a deeper comprehension of the theoretical foundations of the culture of the country of the target language.
***Key words**: RFL, teaching methods, work on the text, foreign student, literary text*

## Введение

Художественный текст является важным материалом в преподавании русского языка как иностранного. Это отчасти связано с той огромной ролью, которую играет художественная литература в русской культуре, а отчасти с тем фактом, что художественный текст – это богатейший материал, который можно использовать с разными целями и с помощью которого можно решить большое количество разнообразных учебных задач. Но преподаватель должен понимать, насколько сложна и многогранна информация, передаваемая художественным текстом.

Как известно, в художественном тексте можно осмыслить все, по крайней мере, авторы стремятся распознать мир через художественный текст (1). Художественный текст является наиболее сложным видом учебного текстового материала, «уроки с его использованием требуют от учителя серьезной филологической подготовки, знакомства с особенностями психологии восприятия художественной литературы, знаний из области методической науки, а также хорошего литературного вкуса и тонкого языкового чутья» (2: 222). Прежде всего, преподаватель всегда должен четко представлять, с какой целью он собирается использовать на уроках по русскому языку как иностранному такой сложный, многоаспектный материал, как художественный текст. Как было отмечено, тексты художественной литературы могут использоваться для решения различных задач (языковых, речевых, лингвострановедческих), но в этом случае целью урока будет работа над грамматикой или лексикой на материале текста. А собственно текстовая работа – это обучение созданию и пониманию текстов.

В европейской системе уровней владения иностранным языком понимание рассматривается как одна из ключевых компетенций, объединяющая такие виды речевой деятельности, как аудирование и чтение. В документе Совета Европы «Общеевропейские компетенции владения иностранным языком» несмотря на то, что существенное внимание уделяется пониманию таких письменных текстов, как справочные материалы, почтовые отправления, инструкции и т.п., особо подчеркивается, что национальная художественная литература является «ценным общим ресурсом, который надо охранять и развивать», а «изучение художественной литературы преследует не только эстетические, но и образовательные, духовные, интеллектуальные и эмоциональные цели» (3: 58). Если в качестве основной цели преподаватель выбирает обучение пониманию, то в этом случае необходимо особым образом подойти к отбору текстового материала. Это должны быть художественные тексты, которые потенциальный читатель захочет и сможет понять. Чтение художественной литературы – не легкий процесс, в некоторых случаях даже для носителя языка, и задача преподавателя сделать его привлекательным для обучаемого, предложив ему такой текст, который вызовет интерес, а значит и желание прочитать и понять. Это могут быть как тексты русской классической литературы, так и тексты современных художественных произведений. Правильно выбранный художественный текст позволит мотивировать учащихся к изучению русского языка, сделав занятия интересными, увлекательными, личностно значимыми для них.

И все же какие тексты выбрать для работы, какие грани текста следует затрагивать в ходе чтения и на каких этапах прочтения текста уместно обнародовать эти грани? (4: 23). Единого рецепта в данном случае нет, все зависит от группы, в которой ведется преподавание, главное выбрать тот материал, который соответствует интересам и настроениям учащихся. Немаловажным является и то, что художественный текст должен нравиться самому преподавателю. По сравнению с классикой произведения современных писателей обладают рядом преимуществ, что позволяет с успехом использовать их при работе с иностранными учащимися. Иностранным читателям интересно узнать о жизни в современной России, им ближе проблемы современников и российских сверстников. В своем собственном жизненном опыте иностранный студент может обнаружить множество сведений, необходимых для воссоздания ситуации современного литературного произведения. К тому же эти произведения написаны на современном языке, который и является предметом изучения, что в свою очередь усиливает, как показывает практика, мотивацию чтения. Однако если учащиеся выражают желание читать классику, преподаватель, безусловно, должен пойти им навстречу. В этом случае, на наш взгляд, целесообразнее выбирать поэтические классические тексты. Выбор стихотворений для чтения и понимания – это сложный, но полезный выбор (2: 3). Благодаря своему небольшому объему и связанному с ним ограниченному набору ключевых единиц текста поэтический текст исключительно удобен для урока, т.к. работа над ним укладывается во время, отведенное для одного занятия. Однако необходимо учитывать тот факт, что поэтический классический текст должен представлять ситуацию, аналог которой имеется в жизненном или читательском опыте учащихся, либо описывать чувства, известные им по собственному опыту. Читатель понимает текст в том случае, если ему понятна ситуация, о которой идет речь в тексте (4: 223). Таким образом, выбор текста должен осуществляться с учетом узнаваемости ситуации, т.к. ситуация относится к числу важных опор, используемых читателем при восприятии текста. К тому же важно отметить: для того, чтобы учащиеся смогли понять текст, необходимо предлагать тексты только со знакомой грамматикой. Что касается собственного практического опыта, то работа на аудиторном занятии с поэтическими художественными текстами русской классической литературы всегда вызывает интерес у учащихся, несмотря на трудности, связанные с глубоким духовным потенциалом классического произведения, а также с наличием порой историзмов и архаизмов, устаревших стилистических оборотов и т.п. Необходимо отметить, что преподаватели не всегда разграничивают понятия «художественный текст» и «художественное произведение». Текст – это основа художественного произведения, а понятие «художественное произведение» гораздо шире, оно включает в себя историю создания произведения, все экранизации, театральные постановки, иллюстрации и т.п. В рамках практического курса РКИ принципиально важно работать именно с художественным текстом, т.к. он обозрим, конечен и предназначен именно для читателя. На этапе предтекстовой работы чтобы вызвать у учащихся интерес к тексту рекомендуем, например, сказать, что изучаемый текст знаком всем русским, или это любимый автор (любимое произведение) преподавателя. В начале урока целесообразно написать на доске имя и фамилию поэта или писателя, а также название стихотворения. Это также является важным для предтекстовой работы, которая призвана заинтересовать читателя, предоставив некоторую информацию об авторе и его произведении. На этом этапе можно немного рассказать об авторе текста, возможно, сообщить какую-либо интересную информацию о нем. О самом произведении лучше не рассказывать, чтобы сохранить интригу и ненароком не раскрыть тайну текста.

Художественная литература, как русская классика, так и современная литература, неизменно вызывает интерес у изучающих русский язык как иностранный. Однако подчас их останавливает страх перед возможными трудностями и неуверенность в своих силах. Снабжая текст разного рода комментариями, объяснениями, словниками и т.п., преподаватель часто способствует укоренению этих опасений, как бы давая понять учащимся, что им самостоятельно никогда не справиться с русскими художественными текстами. Подчеркнем, что только самостоятельное преодоление лексических трудностей при чтении текста на русском языке развивает у учащихся языковую догадку, формирует навыки использования когнитивных стратегий. Разбор преподавателем текстовых единиц перед началом работы с текстом с целью снятия трудностей также методически нецелесообразен, мало того, он вреден, т.к. это разрушает текст, он утрачивает цельность и не может быть понят учащимися. «Настоятельно рекомендуем преподавателям воздержаться от разбора текстовых единиц перед началом работы с текстом с целью снятия трудностей и от различного рода комментариев и семантизаций во время работы с текстом. Вместо комментариев и объяснений тексты должны быть снабжены вопросами и заданиями, нацеливающими читателя на максимально самостоятельную работу: на вдумчивое чтение, смысловое восприятие чужого текста, его эмоциональное переживание, бережное освоение и выработку собственного обоснованного отношения к прочитанному» (5: 72). В данном случае уместны слова

Ричарда Олдингтона: «Ничему тому, что важно знать, научить нельзя, – все, что может сделать учитель, – это указать дорожки». Не рекомендуем во время предтекстовой работы выполнять лексико-грамматические упражнения. Это методически нецелесообразно, т.к. все грамматические категории должны быть уже знакомы учащимся, а с лексическими трудностями можно справиться в процессе работы над текстом. Если художественный текст, предлагаемый для чтения, имеет название, необходимо уделить ему внимание. Притекстовая работа должна начинаться с осмысления названия стихотворения. Преподаватель может предложить учащимся построить читательский прогноз, подумать, о чем может быть текст с таким названием. Как правило, до чтения текста невозможно полностью раскрыть смысл его названия. Не рекомендуется использование наглядности на притекстовом этапе, тогда как на послетекстовом этапе можно и нужно использовать зрительную и слуховую наглядность. Учитывая тот факт, что постоянное прерывание и исправление ошибок демотивирует студентов, преподаватель в процессе аудиторной работы над художественным текстом должен исправлять только коммуникативные ошибки, которые могут изменить смысл высказывания. Данная методика работы над текстом предполагает постоянное углубление в смысл текста: обсуждение следующего фрагмента проверяет понимание предыдущего, поэтому не требуется специальных заданий, контролирующих, как учащиеся поняли тот или иной элемент текста. На послетекстовом этапе контроль понимания текста читателем также нецелесообразен, т.к. на этапе послетекстовой работы в сознании читателя происходит дальнейшая работа над текстом: понимание, оценивание, сравнение. Урок должен проходить с использованием интерактивных технологий обучения пониманию текстов. Преподаватель должен использовать разные приемы работы. Работа над текстом должна быть диалогична, похожа на разговор, обмен мнениями, рассуждение. Учащиеся должны чувствовать себя свободно, высказывать свою точку зрения без опасения быть непонятыми. Преподавателю необходимо активизировать творческую активность учащихся, предлагая им представить то, о чем они читают, описать возникающие в воображении образы. Целесообразно на этапе послетекстовой работы предложить учащимся задания обобщающего характера, чтобы они смогли высказать свое понимание прочитанного, собственное мнение о тексте.

## Заключение

Принимая во внимание тот факт, что в обучении языку художественный текст можно использовать с разными целями, на наш взгляд, все же главная цель уроков с использованием текстов художественной литературы состоит в том, чтобы научить максимально самостоятельному пониманию художественных текстов, сформировать необходимые для этого навыки, что не отменяет решения всех вышеперечисленных задач.

## Литература

1. Бродзели А.О. Текст как лингвострановедческий ресурс обучения речевому общению в преподавании русского языка как иностранного // Университетские чтения – 2015. Материалы научно-методических чтений ПГЛУ. Часть VI. Пятигорск: ПГЛУ, 2015.
2. Кулибина Н.В. Текст как ресурс обучения речевому общению на уроках русского языка как иностранного/неродного. Тексты лекций и образцы уроков (для преподавателей русского языка как иностранного). Вып. 1. М.: Гос. ИРЯ им. А.С. Пушкина, 2011.
3.Общеевропейские компетенции владения иностранным языком: Изучение, обучение, оценка. Департамент по языковой политике, Страсбург. М., 2003.
4. Кулибина Н.В. Уроки русского языка с использованием художественных текстов. Тексты лекций и образцы уроков (для зарубежных преподавателей русского языка). М.: Гос. ИРЯ им. А.С. Пушкина, 2011.
5. Кулибина Н.В. Уроки чтения как способ сохранения духовного наследия. Тексты лекций и образцы уроков (для преподавателей русского языка как иностранного). Вып. 2. М.: Гос. ИРЯ им. А.С. Пушкина, 2013.
6. Зайцева И. А. К вопросу о методике работы над художественным текстом на уроке РКИ / И. А. Зайцева. — Текст : непосредственный // Молодой ученый, 2017, № 13 (147).

**Рецензент: доц. С.Рахманова**

Göndərilib: 08.02.2021 Qəbul edilib: 10.02.2021

DOI: 10.36719/2663-4619/63/46-50

**Lalə Baladadaş qızı İbadova**
Azərbaycan Dillər Universiteti
baş müəllim
lalaibadova77@mail.ru

# İSPAN DİLİNDƏKİ ƏRƏB ALINMALARINDA CİNS VƏ KƏMİYYƏT KATEQORİYALARI VƏ MƏSDƏRLƏR (FELİ İSİMLƏR)

***Açar sözlər:*** *morfoloji göstərici, formal cins kateqoriyası, düzgün cəm, sınıq (daxili) cəm*

## Categories of gender and number and infinitive in Arabic borrowings in the modern Spanish language

**Summary**

The article called "Category of the gender and number and infinitive in Arabic borrowings in the modern Spanish language" issues of relative gender and number of Spanish words of Arabic origin. It is pointed out that the number of words in the sourse language may not always coinside with the same parameters of the language accepting these borrowings. Alsa cases of hesetations, relatively connected with this problem are also considered. Infinitives of the first, second and the fourth nature of infinitives are studied as well in the article. The article partially reflects the consideration of the given scientific problem.

***Key words****: morphological indications, formal gender category, regular plural, internal plural*

### 1. Ərəb mənşəli ispan isimlərinin cins kateqoriyası barədə

Jan Dübua yazır ki, əcnəbi leksik vahid alınandan sonra onun "cins səviyyəsində" inteqrasiyası məsələsi ortaya çıxır. (6, səh. 14). Tədqiqata cəlb olunmuş hər iki dildə qrammatik cins kateqoriyası vardır və faktiki materialın təhlili aşkarladı ki, həm ispan həm də ərəb dilində kişi və qadın cinsləri vardır.

Ərəb dilində kişi cinsinin morfoloji göstəriciləri yoxdur; qadın cinsində isə bu göstəricilər aşağıdakılardır: **-atun**, **-a:u**, **-a**. Məsələn: madin**atun** "şəhər", baid**a:u** "çöl, biyaban", dikr**a:** "xatirə" (3, səh. 387).

İsimlərin alınmasında mənbə dildəki cinslə söz alan dildəki cinslər uyğun gəlməyə də bilərlər. Hərdən elə olur ki, sözlərin cins nöqteyi-nəzərindən tərəddüdlər də ortaya çıxır. Eyni söz eyni məna ilə həm kişi həm də qadın cinsində işlədilir: nácar *m* // nácara *f* < ər. نقّارة [na**qq**a:ra] müxtəlif musiqi alətləri və ayrılıqda "ilbiz, balıqqulağı, buynuz".

Tədqiqat materiallarının təhlili göstərdi ki, əksər hallarda alınan sözlərin qrammatik cinsləri alan dilin sözləri ilə üst-üstə düşür. Tədqiqata cəlb olunmuş 600 leksik vahidin 341-i kişi cinsində, 226-sı isə qadın cinsindədir. Bu da ümumi söz korpusunun 567 vahidini təşkil edir. Onlardan cansız isimlər 522 leksik vahid, canlılar isə 45 leksik vahiddən ibarətdir ki onların 37-si kişi cinsli, 8-i isə qadın cinslidir.

**1.1.** ***Ərəb dilində kişi cinsində olub ispan dilinə eyni cinslə gələnlər*** (214 leksik vahid):

acimut *m* < ər. - سموت [sumu:t] سمت [samt];
alacrán *m* < ər. عقرب [aqrab];
aljófar *m* < ər. جواهر [cava:har];
arraez *m* < ər. الرَّإس ['ar-ra'isu];
badén *m* < ər. بطن [ba**T**n];
bórax *m* < ər. بورق [bu**:**ra**q**un];
califa *m* < ər. خليف [**x**ali**:**fun];
emir *m* < ər. أمير ['ami**:**r];
jabalí//jabalín *m* < ər. خنزير جبلى [xınzır cabali:];
laúd *m* < ər. العود ['al'u**:**d];
nadir *m* < ər. ***نظير*** [naDi:r];
sultán *m* < ər. سلطان [sul**ta:**nun];
vali *m* < ər. والى [va:li];
zumaque *m* < ər. سمَّاق [summa:**q**un] və digərləri.

**1.2.** ***Ərəb dilində kişi cinsində olub ispan dilinə qadın cinsində gələnlər*** (33 leksik vahid):

acerola *f* < ər. الزعرور ['-al-zu'ru :r];
adehala *f* < ər مداخل [mada:**x**al];
aduána *f* < ər. ديوان [di:va:na];

alcachofa *f* < ər. خرشوف [‘al-**x**urşu:f];
alcaravea *f* < ər. كرويَّا [kar**v**iyya**:**];
berenjena *f* < ər. بادنجان // **باذنجان** [ba**:**dinca**:**nun];
cifra *f* < ər, صفر [**s**ifrun];
gacela *f* < ər. غزال [ğaz:al];
mezquita *f* < ər. مسجيد [másci:d] ;
tara *f* < ər. طرح [**t**arḥ un];
zalema *f* < ər. سلم [salém] və bir çox başqaları.

**1.3.** ***Ərəb dilində qadın cinsində olub ispan dilinə qadın cinsində gələnlər***.

Formal qadın cinsi əlaməti **-at**(un) olan ərəb isimləri ispan dilində qadın cinsi kimi qəbul olunmuşlar. Bu qəbildən olanlar 105 leksik vahidi əhatə edir:

acequia *f* < ər. ساقيَّة [sa:**q**iyya];
alcabala *f* < ər. قبَّالة [**q**abb**:**latun];
alcazaba *f* < ər. القصبة [‘al- **q**a**s**aba];
alcoba *f* < ər. القبَّة ['al-**q**ubbatu];
alfombra *f* < ər. الحمراء [‘alhamr:au];
algarabia *f* < ər. العربيَّة ['al-'arabiyyatu];
algarada *f* < ər. الغارة ['al-ğa**:**ratu];
algarroba *f* < ər. خرنوبة ['al-xurnu:bu];
casida *f* < قصيده [**q**asida];
jirafa *f* < ər زرافة [ẕ ara**:**fa];
matraca *f* < ər. مطرقة [ma**tr**a**q**a];
sófora *f* < ər. صفيراء [**ṡ** ufira**:**'u];
tarifa *f* < ər. تعريفة [ta’rifa] və qeyriləri.

**1.4.** ***Ərəb dilində qadın cinsində olub ispan dilinə kişi cinsində gələnlərin*** miqdarı o qədər də çox deyil- 11 leksik vahid:

alminar *m* < ər. منارة ['al-mana**:**ra];
aval *m* < حوَّالة [ḥ a**vv**a**:**la];
café *m*.< ər. قهوة [**q**ah**v**a];
jubón *m* < ər. جبَّة [cubba];
papagayo *m* < ər. ببغاء [babağ’a:’] və s.

Düşünürük ki, çəkilmiş misallarispan dilində işlədilən ərəb alınmalarının qrammatik cəhətdən mənimsənilməsinə əyani sübutdur, belə ki, mənbə dilin cins kateqoriyası ispan dilinin normalarına uyğun dəyişir və bununla da yeni qrammatik aspekt kəsb edir. Roman dillərində işlədilən alınma isimlərdə cinsin dəyişməsi məsələsinə həsr olunmuş bəzi tədqiqatlarda hesab olunur ki, bu hər şeydən əvvəl suffiks və sonluqlarla bağlıdır, çünki onlar müəyyən bir qrammatik cinsin morfoloji göstəriciləri kimi qəbul olunurlar. (7, səh. 96).

Digər tədqiqatçılar hesab edirlər ki, dəyişikliklər sırf formal əlamətlərə görə baş verir. Saitlə bitən isimlər qadın cinsinin əlamətlərini, samitlə bitənlər isə kişi cinsinin əlamətlərini alırlar.

**2. İsimlərin kəmiyyət kateqoriyası**

Ərəb dilində kəmiyyət kateqoriyası özündə üç subkateqoriyanı birləşdirir: tək isimlər, ikili cəmi olan isimlər və ya təsniyə (tək ilə cəm arasında olaraq iki şəxsi və ya iki şeyi birləşdirən kəmiyyət) və cəmdə olan isimlərdir. Tədqiqata cəlb olunmuş materialın təhlili göstərdi ki, ispan dili təsniyə kimi ikili cəmdə olan ərəb sözləri almayıb.

İsimlərin cəmi a) “düzgün cəm" (suffikslər vasitəsilə düzəldilir) və b) “sınıq (daxili) cəm” olaraq iki yerə ayrılır. Kişi cinsi üçün ***–una***, ***-ina***, qadın cinsi üçün isə ***-atun*** işlədilir. Məs.: mu’allimuna “müəllimlər”, mu’allimatun "müəllimələr"; sınıq (daxili) cəm daxili fleksiya yolu ilə düzəldilir və bunun üçün30-a yaxın modellər mövcuddur. Məs.: ***kita:bun*** "kitab", cəmdə. ***kutubun***; ***jaba:lun*** "dağ" – cəmdə. ***jiba:*** (4, səh. 388).

İspan dilinə gəldikdə isə flektiv yolla düzəldilən kəmiyyətin iki subkateqoriyası vardır: tək və cəm. Bu vaxt cəmdə flektiv üsul olan –s sözlərin sonuna əlavə edilir.Tədqiqat materialları aşkarladı ki, bir qayda olaraq, ərəb leksik vahidləri, mənbə dildə cəmdə olsalar belə, tək vahid kimi alınır və ispan dilinin kəmiyyət kateqoriyasına tam tabe olur, bu vaxt ispan dili cəmin unifikasiyasını aparır və sözlərə özünün qrafik formasını əlavə edir. Cəmdə olan ərəb sözləri morfoloji cəhətdən tam mənimsəniləndən sonra ispan dili cəminin qrafik formasını qəbul edir.

İspan dili “düzgün cəm" vasitəsilə düzəldilən sözlər almayıb. Amma tədqiqat materiallarının təhlili aşkarladı ki, ispan dili “sınıq (daxili) cəm” –lə düzəldilən bəzi sözləri alıb və onları öz sistemində əridərək

morfoloji qanunlarına tabe edib. Bununla da ərəb sözlərinin cəmi ispan dilində təkdə olan sözlər kimi qəbul edilib və onun morfoloji standartlaına tam uyğunlaşdırılıb. Misallara müraciət edək:

isp. ***acimut*** *m* < ər. - سموت [sumu:t] “paralel” سمت [samt] sözünün cəm forması. Məs.: El error de la desviación estática de la orientación del *acimut* entre el radar y la imagen de la carta será inferior a ± 0,5 grados.

isp. ***almacén*** *m* < ər مخازن [ma**x**a**:**zinu] - مخزن [ma**x**zanun] sözünün cəmi - “anbar, depozit, ehtiyat”, خزن [xəzənə] “ehtiyatda saxlamaq” sözündən gəlir və ispan dilinin cəm parametrlərini qəbul edir. Almacén aduanero-gömrük anbarı. Törəmələri: Almacenar, Almacenaje. Almacenero. Almacenista.

isp. ***nabab*** *m* < ər. نوّاب [na**vv**a:b] - نائب [na:ibun] sözünün cəmi “çox varlı adam, idarə edən, başçı, kral”.

isp. ***tambor*** *m* < ər. طبول [tubu:lun] - طبل [**t**ablun] sözünün cəmi "baraban”, əvvəlki sözlər kimi bu söz də yeni dil mühitinin qanunlarına tam tabe olmuşdur.

Misal gətirilən bu sözlərin morfoloji adaptasiyası bu cür baş verir: ispan dilində qəbuledilməz olan ərəb dilinin cəm forması rədd edilir və söz alan dilin cəm şəkilçisi olan «**s**» göstəricisini qəbul edir. Bununla da sanki qoşa cəm yaranır-ərəb dilinin cəmi və ispan dilinin cəmi. Alınma sözlərə həsr olunmuş dilçilik ədəbiyyatında bu faktlara rast gəlmək mümkündür (1, səh. 55-60)

**Ərəb dilinə xas olan məsdərlərin (feli isimlərin) realizə olunması**

Bu tədqiqat işində məsdərlərə (feli isimlərə) müəyyən yer ayrılır. Tədqiqat materiallarının təhlili ispan dilində işlədilən ərəb sözləri içərisində xeyli miqdarda məsdərin olmasını aşkarladı. Ərəb qrammatistləri feli ismi (hərəkətin adını) məsdər adlandırırlar, çünki bu kateqoriyanı onlar bütün fel formalarının semantik mənbəi hesab edirlər. Öz mənasına görə feli isim (hərəkətin adı), mücərrədd olaraq, fel formalarına xas olan heç bir xüsusiyyətə malik deyil. Bununla belə, ərəb dilində məsdər həm forma, həm də içlənməsinə görə isimdir. Onu felə yaxınlaşdıran sintatik əlaqələrdirin bəzi xüsusiyyətləridir. (3, səh.186-189).

Ərəb dilçiliyində məsdərlərin qrammatik funksiyaları ilə bağlı məsələlər, ta qədimdən bugünədək, elə aktual olmuşdur ki, bu məsələ Xəlil ibn Əhməd, Sibaveyhi, əl-Mazini, əl-Afxaş və digər məşhur dilçilərin diqqətini cəlb etmişdir. Bu da öz növbəsində ərəb dilçiliyində iki linqvistik məktəbin, Bəsrə və Kufə məktəblərinin yaranması ilə nəticələndi. Bu məktəbləri təmsil edənlərin məsdərə dair bir-birinə əks olan nöqteyi-nəzərləri var idi. Kufə qrammatistlərinin fikrincə cümlənin nüvəsini ***fel - xəbər*** təşkil edir, buna görə də əsas (başlanğıc) forma fel hesab edilirdi. Bəsrə qrammatistləri isə, cümlənin başlanğıcını isim təşil etdiyindən, hesab edirdilər ki, hərəkətin adı və ya məsdər əsas (başlanğıc) formadır və o, leksemin mənasını, necə deyərlər, xüsusi şəkildə verir. (2, səh. 157).

Feli isimləri tədqiq edən A.F. Xaşşab onlara aşağıdakıları aid edir :

a) hərəkətin adı və ya məsdər - المصدر [‘al ma**s**daru];
b) hərəkəti icra edənin adı - آسم الفاعل [‘ism-ul-fa:’il];
c) hərəkət obyektinin adı - آسم المفعول [‘ism-ul-maf‘u:l];
ç) bir dəfə icra olunan hərəkətin adı - آسم المرّة ['ism-ul-marrati];
d) tərzi-hərəkətin adı - آسم النّوع [‘ism-un-nu:‘i];
e) hərəkətin məkan və zamanının adı - آسم المكان و الزّمان [‘ism-ul-maкa:ni vaz-zama:ni];
ə) hərəkəti icra edən alətin adı - آسم الألة [‘ism-ul-‘a:ləti] (5, səh. 63).

Bu dissertasiya işində “***məsdər***” anlayışı altında biz ərəb dili məsdərlərindən qaynaqlanan ispan sözlərini nəzərdə tuturuq. Hesab edirik ki, bu cür yanaşma ərəb formalarının ispan dilində realizə olunması baxımından tam qanunauyğundur. Bu səbəbdən də biz ərəb dilinə aid məsdərləri onun növləri ardıcıllığı ilə tədqiq edirik. Deməк yerinə düşərdi ki, flektiv qrupa xas olan ərəb sözləri analitik quruluşlu ispan dilinə gəldikdə özlərinin morfoloji formalarını da gətirirlər.

**I növ məsdərlər**

فاعل [***fa:’alun***] modelinə əsasən yaranmış ərəb məsdəri غارة [**ğa:**ratun] "qarət” ispan dilində ***algarada*** *f* "kiməsə qarşı əli silshlı hücum” kimi realisə olmuşdur.

La *algarada* duró una hora, con insultos de «cerdos italianos» y «marranos fascistas».

فعال [***fa:’alun***] modelinə əsasən yaranmış ərəb məsdəri شراب [şara**:bun**] I. "içki; 2. "şərab” ispan dilində ***jarabe*** *m* - 1) sirop (qatı olmayan); 2) mikstura (öskürəyə qarşı); 3) şəkərli meyvə şirəsi; 4) xarabe (ispan və latın amerikasıxalqlarının rəqsi) kimi realisə olmuşdur. Pero huele como manteca y jarabe.

.فعلان [***fu’la:nun***] modelinə əsasən yaranmış ərəb məsdəri سلطان [sul**T**a:nun] "sultan, hökmdar, padşah" ispan dilində ***sultán*** *m* “sultan, şah, kral” və ***sultana*** *f* "sultanın xanımı" kimi həm kişi həm də qadın cinsində realizə olmuşdur.

Məs. El sultan ya es viejo, y los viejos son como los niños.

Poco a poco... ...desarrolle una teoría... ...de por que fui a ver a la sultana.

فعالة [***fa'a:latun***] modelinə əsasən yaranmış ərəb məsdəri نقّارة [na**qq**a:ratun]

ispan dilində ***nácar*** *m*/***nácara*** *f* kimi iki orfoqrafik formada realizə olmuş, müxtəlif musiqi alətləri və ayrılıqda "ilbiz, balıqqulağı, buynuz" mənalarını bildirir.

فعال [***fu'a:lun***] modelinə əsasən yaranmış ərəb məsdəri سمَّاق [summa:**q**un]

"qırmızıya çalan rəng" mənasında ispan dilində ***zumaque*** *m* kimi realizə olunmuşdur. Participación financiera en un proyecto de demostración relativo a la introducción de nuevas técnicas de cultivo en la producción del zumaque. Həmçinin, bu modellə yaranmış زرافة [z̲ ura:fatun] ispan dilində ***jirafa*** *f* "zürafə" mənasında reallaşmışdır.

فعل [***фу'лун***] modelinə əsasən yaranmış ərəb məsdəri ربع [rubun] "qaynadılmış meyvə, üzüm şirəsi" mənasında ispan dilində ***arrope*** *m* 1) üzüm şərbəti; 2) müalicə otu qarışdırılmış bal şərbəti; 3) üzüm kolunu torpaqla örtmə, mənalarında realizə oluşdur. Hace referencia al proceso particular que implica la prohibición de utilizar arrope.

فعلالة [***fa'la:latun***] modelinə əsasən yaranmış ərəb məsdəri قبَّالة [**q**abb**:**latun] "vergi (duz vergisi) mənasında ispan dilində ***alcabala*** *f* "vergi ödəmək yolu ilə hansısa bir torpaq sahəsinin istifadəyə götürülməsi, bəxşiş olunması" kimi realizə olunmuşdür.

Bu modelə əsasən yaranmış dördköklü ərəb məsdəri جلفطة [calfa**T**atun] "gəmi göyərtəsində döşəməni tıxamaq" mənasında ispan dilində ***calafatear*** *vt* "gəminin döşəməsini qətranlamaq, tıxamaq, kəpitkələmək" kimi realizə olunmuşdür.

Həmçinin bu modelə əsasən yaranmış dördköklü ərəb məsdəri سلطنة [sal**T**anatun] "sultanlıq, səltənət, dövlət" mənasında ispan dilində kişi cinsli ***sultanía***/***sultanato*** "dövlət" mənasında realizə olunmuşdür.

El artículo 5 de la Constitución establece que el Estado es una Sultanía hereditaria.

La Ley también permite que las autoridades pertinentes intercambien información con otros Estados obligados por una convención ratificada con el Sultanato o por una condición de reciprocidad.

**II növ məsdərlər**

تفعيلة [***taf'i:latun***] modelinə əsasən yaranmış ərəb məsdəri تريفة [ta'ri:fatun] "tarif" mənasında ispan dilində ***tarifa*** *f* "tarif, tədiyə, vergi", "rüsum", "maaş" kimi realizə olmuşdur. Hacen una *tarifa* especial para alcaldes. La *tarifa* se basa en la distancia recorrida.

فعال [***fa'a:lun***] modelinə əsasən yaranmış ərəb məsdəri دوَّار [da**vv**a**:**run] "ağıl" (mal-qara üçun) mənasında ispan dilində ***aduar*** *m* 1) ağıl, xabxal (mal-qara ərtafında dövrə şəklində yaradəlməş düşərgə; 2) beduinlər kəndi" mənalarında realizə olunmuşdür. Se han previsto iniciativas directas que beneficiarán a 5.000 niños en 40 pueblos y *aduares* situados principalmente en el Gharb y Taroudant.

فعال [***fa'a:lun***] modelinə əsasən yaranmış ərəb məsdəri غزال [ğaz:alun] "ahu, qəzal ceyran" mənasında ispan dilində ***gacela*** *f* "Afrika və Asiyada yaşayan antilop növü" mənalarında realizə olunmuşdür. Todavía te siento observándome como un guepardo observa a una *gacela*. La hallé así, perdida y tratando de ocultarse como una *gacela* que ha sufrido una herida mortal.

**IV növ məsdərlər**

إفعال [***'if'a: lun***] modelinə əsasən yaranmış ərəb məsdəri

إسلام ['isla:mun] "müsəlman, islam dinini qəbul etmiş" mənasında ispan dilində ***islam*** *m* "tanrıya itaət, müsəlman, islam dini" mənalarında realizə olunmuşdür.

Los grandes dirigentes y estudiosos del *islam* nos dicen otra cosa. El *islam* recomienda moderación y prohíbe el terrorismo.

Tədqiqat materialları aşkarladı ki, ispan dilində 15 növ ərəb məsdərindən yalnız üçü (I, II, və IV) iştirak edir.

Göstərilmiş misallara istinadən deyə bilərik ki, ispan dilinin aldığı ərəb məsdərləri öz mənalarını qoruyub saxlayır və morfoloji baxımdan eyni proporsiya ilə həm kiçi həm də qadın cinsində realizə olunurlar. I növ məsdərlərə aid verilmiş misallar buna sübutdur (***jarabe*** *m*, ***sultán*** *m*, ***nácar*** *m*, ***zumaque*** *m*, ***arrope*** *m*, ***sultanía*** / ***sultanato***; ***algarada*** *f*, ***sultana*** *f*, ***nácara*** *f*, ***jirafa*** *f*, ***alcabala*** *f*.). Göstərilmiş üç növün işlənmə dairələri də kifayət qədər genişdir. Verilmiş misallar bunu bir daha dəlalət edir. Bu sözlər isim kateqoriyasına daxil olaraq fel növlərilə bağlıolan bütün əlaqələri itirir və müxtəlif sözlərin yaranmasının əsasında dururlar.

"Morfoloji baxımdan ərəb məsdərləri ismin fleksiyalarına malikdir, hallar üzrə dəyişə bilir və müəyyən və qeyri-müəyyən olurlar. Sintaktik əlaqələr baxımından ərəb məsdərləri qrammatik mübtəda və xəbər funksiyalarının yerində işlədilir (3, səh. 190).

Hesab edirik ki, məsdərlərin məhz bu parametrləri onların ispan dilində isim kateqoriyasına daxil olmasına imkan verir.

## Ədəbiyyat

1. Аль-Аббаси Х.Н. Об употреблении в азербайджанском языке имен существительных, заимствованных из арабского языка в форме множественного числа. -В кн.: Научные труды. Серия Востоковедение. Изд-во Азерб. гос. ун-та им. С.М.Кирова, Баку, 1979. № 2, стр. 55-60.
2. Амирова Т.А., Ольховиков Б.А., Рождественский Ю.В. Грамматическое учение арабов. // Очерки по истории лингвистики. -М.: Наука, 1975. -559 с.
3. Гранде, Б.М. Курс арабской грамматики в сравнительно-историческом освещении. -М.: Изд-во вост. лит-ры, 1963. - 595 стр.
4. Гранде, Б.М. Введение в сравнительное изучение семитских языков. -М.: Наука, 1972.- 444 стр.
5. Хащаб А.Ф. Грамматика арабского языка. - С.-Петербурга, часть I, 1910. -134 стр.
6. Dubois J. L'emprunt en français. -In. Information littéraire. P.,1963, № 1, p.10-16.
7. Nyrop Kr. Grammaire historique de la langue française. Copenhague, 1936. t . 3. p. 479.

**Rəyçi: dos. A.Quliyeva**

Göndərilib: 07.02.2021 Qəbul edilib: 10.02.2021

DOI: 10.36719/2663-4619/63/51-54

**Sevinc Məhərrəm qızı Hacıyeva**
Azərbaycan Dövlət İqtisad Universiteti (UNEC)
baş müəllim
calil.farah72@mail.ru

# AZƏRBAYCAN DÖVLƏT DİLİNİN MÜASİR İNKİŞAF PERSPEKTİVLƏRİNƏ DAİR TƏDQİQLƏR

***Açar sözlər:*** *Azərbaycan, dil, inkişaf, dövr, müasir, klassik*

**Research on the prospects of modern development of the Azerbaijani state language**
**Summary**

As a factor proving the identity of a people, language is one of the main attributes of the state established by that nation. After Azerbaijan gained its independence, the state's care for the Azerbaijani language increased.

Although the Azerbaijani language, which first became the state language of the Safavids in the 16th century, was influenced by Persian and Russian over time, care for the Azerbaijani language increased after Azerbaijan gained independence. Today, many decrees and orders are being implemented in connection with the development of the Azerbaijani language. As a follower of the Heydar Aliyev tradition, Mr. Ilham Aliyev also pays special attention to the development of the Azerbaijani language.
***Key words:*** *Azerbaijan, language, development, period, modern, classical*

## Giriş

İltisaqi (aqlütinativ) dillər qrupuna axil olan Azərbaycan dili ənənəvi-morfoloji və ya tipoloji təsnifat baxımından iltisaqi dil hesdab edilir.

Azərbaycan dili türk dilləri arasında öz ahənginə və söz zənginliyinə görə xüsusi mövqeyə sahibdir. Üslub zərifliyi, ahəngdarlığı, lüğət zənginliyi ilə bir çox xalqların diqqətini çəkmiş dilimiz hələ XII əsrdə bir çox dilçi alimlərin maraq dairəsində olmuşdur.

Azərbaycanın görkəmli dilşünas alimi Xətib Təbrizi ilə öz müəllimi məşhur ərəb alimi Əbü-Əla əl Mərri ilə bağı xatirlərindən birində yazırdı ki, ustadının yanında dərs keçərkən birdən uzun zaman görüşmədiyi qonşuları ilə qarşılaşır. Ustadından izin alaraq qonşusu ilə Azərbaycan dilində bir xeyli söhbət edir. Mərri Xətib Xəbrizidən onun hansı dildə danışdığını soruşur. Xətib də biz Azərbaycan əhalisinin dilində danışırdıq deyir. Mərri deyir: "Mən bu dili bilmirəm, ancaq sizin bütün danışdıqlarınızı təkrar edə bilərəm" (3, s. 8). Bu fakt Azərbaycan dilinin aydınlığı, ahəngdarlığı və səlistliyindən bir daha xəbər verir.

Bu günə qədər aparılan tədqiqatların sonucu olaraq demək olar ki, Azərbaycan dli öz inkişafı dövründə üş mərhələdən keçmişdir.

**Birinci dövr Azərbaycan dili öz inkişafında iki mərhələdən keçmişdir:**

1) ədəbi dilin təşəkkül mərhələsi (XIII-XIV əsrlər),
2) klassik şeir dili mərhələsi (XV-XVII əsrlər).

**İkinci dövr Azərbaycan dili isə üç mərhələni əhatə edir:**

1) ədəbi dilin xəlqiləşməsi mərhələsi (XVIII əsr),
2) milli dilin yaranması və inkişafı mərhələsi (XIX-XX əsrin əvvəli),
3) müasir mərhələ (XX əsrin 1-ci rübündən sonra).

**Yeni dövr.** Azərbaycan dili böyük inkişaf yoluna özünün ikinci inkişaf mərhələsində (Milli ədəbi dilin təşəkkülü və inkişafı mərhələsində) çıxır. (5, s.17)

Azərbaycan dili orta çağda ərəb və fars dillərinə XVIII əsrdən etibarən isə rus və Avropa dillərinə inteqrasiya etməklə lüğət fondunu zənginləşdirmişdir.

Nizami Cəfərov Azərbaycan dilinin digər dillərə münasibəti ilə bağlı fikirlərindən birində qeyd edir ki, "Azərbaycan xalqı (ümumən türk xalqları) heç zaman dünyaya qovuşmaqdan, yaxud beynəlxalq inteqrasiyadan imtina etməmişlər. Və dilimizdə olan minlərlə ərəb, fars, Avropa sözləri də bunu təsdiq edir. Həmin sözlər o sözlərdir ki, bütün xalqlar üçün səciyyəvi olan məişət-etnoqrafiya həyatına aid olan anlayışları deyil, intellektual-elmi idrak sahələrini əhatə – ifadə edir ki, bu da Azərbaycan türklərinin ümumbəşəri dəyərlərə heç vaxt biganə qalmadıqlarını və bundan sonra da biganə olmayacaqlarını göstərir" ***(www.yap.org.az/az/ view/interview/188/)***

Azərbaycan ədəbi dilinin orta çağda fars ərəb təsirlərinə məruz qalmasına baxmayaraq XIII əsrdən başlayaraq İzəddin Həsənoğlunun, S.Ərdəbilinin Azərbaycan türkcəsində yazdıqları ilk bədii ədəbi dil nümunələri ilə qarşılaşırıq.

Böyük inkişaf yolu keçmiş Azərbaycan dilinin XIII əsrə xas olan yazılı nümunələrindən də "Kitabi-Dədə Qorqud" dastanlarıdır. Dastanda biz XII-XIII əsrlərə məxsus Azərbaycan dilinin əcdadı sayılan oğuz dil qrupunun çox güman ki, Güney Azəırbaycan dialekti ilə qarşılaşırıq. XIV əsrdən başlayaraq poeziyamızda Nəsimi, Füzuli, Şah Xətai kimi məşhur şairlər Klassik dövr Azərbaycan şeir sənətini Azərbaycan dilində yazmaqla dilimizin daha da zənginləşməsində müstəsna rol olynamışlar.

Tofiq Hacıyev "Azərbaycan ədəbi dilinin tarixi əsərində" klassik dövr Azərbaycan dilinin formalaşmasında Nəsimi, Füzuli, Qurbani, Xətai Qövs Təbrizi və s. kimi poeziya ustadlarının Azərbaycan ana dilinin formalaşmasında xüsusi məktəbə sahib olmaları öz üslubları ilə Azərbaycan dilinə bəxş etdikləri tövhələrdən bəhs edərkən yazır: "Bu əsrlər XIII-XVI yüzillikləri əhatə edən mərhələnin tərkib hissəsidir... XIII əsrlərdə Azərbaycan divan ədəbiyyatının dili formalaşır. Ədəbi dilin lüğətində ərəb, fars sözləri xüsusi fəallıq qazanır, geniş kütləyə çevrilir. Müasir xalq dilindəki ərəb, fars sözlərinin hamısının həmin dövrlərdən gələn yazılı ədəbiyyatın dilində işlənməsi göstərir ki, bu sözlər xalq ünsiyyət dilinə də nüfuz edibmiş" (2, s. 161).

Səfəvilər dövründə Azərbaycan dili daha da inkişaf edərək dövlət dili statusu əldə edir. Belə ki, həmin dövrdə Azərbaycan sadə xalq danışıq dilindən yeni bir mərhələyə keçir və rəsmi dövlət dili statusu qazanmış olur. Bu haqda Xaqan Balayev Səfəvilər dövründən etibarən Azərbaycan dilinin tarixi inkişafı ilə fikirlərindən birində yazır: "Azərbaycan dili türk mənşəli ümumxalqxalq canlı danışıq dili zəminində şifahi ədəbi dilə çevrilənədək və sonradan bu əsasla Azərbaycan ədəbi dilinin yazılı qolu təşəkkül tapana qədər yüzillər boyunca mürəkkəb bir yol keçmişdir. Ağqoyunlular dövlətinin yerində yaranmış yeni Azərbaycan dövləti Səfəvilər dövləti həm ərazicə, həm də hərbi-siyasi baxımdan Ağqoyunlular imperiyasına nisbətən daha qüdrətli, eyni zamanda bütün yaxın və orta şərqdə Osmalı imperiyasından sonra ikinci böyük hərbi-siyasi qüvvə olmaqla yanaşı Azərbaycan dilini dövlət dili səviyyəsinə qaldırmaqla da əlamətdardır" (1, s. 8)

XVIII əsrdən etibarən isə Vaqif yaradıcılığı ilə başlayan realizm Azərbaycan yazılı ədəbiyyatının əsasən Azərbaycan dilində formalaşmasına təkan vermiş oldu. XIX əsrdən sonra maarifçilik ideyasının Azərbaycana təsiri nəticəsində Azərbaycan dilçilik elminin təməli qoyulmuş oldu, dilimizin nəinki inkişafı eyni zamanda onun tədqiqi ilə bağlı işlərə başlanıldı.

Bu dildə şeirlə yanaşı, nəsr və dram əsərləri yazılır, qəzet və jurnallar nəşr edilir, o bəzi rəsmi sənədlərdə, elmi tədqiqatlarda da işlənməyə başlayır. O dövrdə Azərbaycana gələn xaricilər, ruslar və almanlar da ona maraq göstərir, bəziləri bu dili öyrənməyə başlayır. Məsələn, rus şairləri Lermontov, Bestujev-Marlinski, alman şərqşünası Bodonştedt. Sonuncusu XIX əsr Azərbaycan şairi Mirzə Şəfidən Azərbaycan dilini və onun şeirlərini almancaya tərcümə edərək Berlində ayrıca kitab şəklində nəşr etdirmişdir. Orta əsrlərdə əski Azərbaycan dilinə aid tərcümə lüğətləri və qrammatik tədqiqatlar aparılmış olsa da, Azərbaycan dilinə aid elmi əsərlər və dərsliklər XIX əsrdən etibarən yazılmağa başlayır (5, s.8).

Azərbaycan dilinin inkişafında müstəsna xidmətləri olan Mirzə Kazımbəyin rusca yazdığı "Türk-tatar dilinin ümumi qrammatikası" əsəri də buna bariz nümunədir.

M.Vəzirovun, L.Budaqovun, Q.Makarovun, N.Nərimanovun, M.L.Məmmədovun, S.M.Qəniyevin Azərbaycan dilinə aid dərslikləri də rus dilində yazılmışdır. L.Budaqovun ikicildlik lüğəti də ("Сравнительный словарь турецко-татарских языков") var. M.Əfşarın Azərbaycan dilinə aid "Fənni-sərfi-türki" ("Türk dilinin qrammatikası") adlı dəyərli əsəri isə azərbaycancadır (5, s. 8).

Cümhuriyyət dövründə də Azərbaycan maarifpərvər ziyalıları ilk növbədə Azərbaycan dilinə xüsusi diqqət ayırırlar.

Azərbaycan xalq cümhuriyyəti dövründə dil siyasəti xüsusi diqqət yetirilən əsas sahələrdən biri olduğunu sübut edən faktlardan biri də budur ki, AXC hökumətinin 1918-ci il 27 iyun tarixli qərarı ilə o zaman türk dili adlanan Azərbaycan dili dövlət dili elan edilir. Bu gün həmin tarixi hadisədən 100 il ötür. (https:// nizamimuseum.az/az/news/1595).

X.Balayevin də qeyd etdiyi kimi, AXC hökumətinin ilk ən mühüm qərarları sırasında dövlət dili haqqında qərar verməsi təsadüfü deyildi (1, 13). Lakin təəssüflər olsun ki, "N.Nərimanovun Azərbaycan Xalq Cümhuriyyəti hökümətinə irad tutaraq türk dilinin dövlət dili olması üçün Dekret verməyə bir cəsarət etməyiblər" yazması "Dövləti-Nisan" haqqında qərardan xəbərdar olmadığına görə yalnışlığa yol verdiyinə dəlalət edir (1, s.13).

Azərbaycanda Sovet hakimiyyəti yaradıldıqdan sonra yalnız 1956-cı ildə Azərbaycan CCRİ Ali Sovetinin qərarı ilə 1937-ci il konstitusiyasına maddə əlavə edilsə də bu qərar uğulu olmayıb (https:// nizamimuseum.az/az/news/1595).

Bu deyilənlərdən də aydın olur ki, Azərbaycan dilinin inkişafı da, problemləri də daha çox XX əsrlə bağlıdır. Məhz bu dövrdə Azərbaycan ədəbi dili bənzərsiz bir problemlə qarşılaşır. Əsrin əvvəllərindən başlayaraq, ədəbi dildə üç meyl, üç istiqamət özünü göstərir. Təbiidir ki, bu ən çox bədii əsərlərin dilinə və mətbuata aiddir (5, s. 3).

Yeni dövr Azərbaycan ədəbi dilinin üçüncü, yəni müasir mərhələsində dil həyatının mühüm hadisələrindən biri Azərbaycan ədəbi dilinin dövlət dili statusu almasıdır.

Azərbaycan dilinin ölkənin dövlət dili kimi elan edilməsində Azərbaycan xalqının ümummilli lideri Heydər Əliyevin çox böyük xidmətləri olmuşdur. Bəlli olduğu kimi, dövlət dili sahəsindəki fəaliyyətə Heydər Əliyev ölkəyə rəhbərliyə gəldiyi ilin (1969) ilk günlərindən başlamışdır (5, s.3).

Nizami Cəfərov bununla bağlı öz fikirlərindən birində qeyd edir: "Ümumiyyətlə, Ulu öndər Heydər Əliyevin həyata keçirdiyi dil siyasəti Onun dövlət quruculuğu siyasətinin tərkib hissəsi olub. Ulu öndər sovetlər hakimiyyəti dövründə də Azərbaycan dilinin inkişafı üçün əvəzolunmaz xidmətlər göstərib. Ali məktəblər üçün yazılmış "Müasir Azərbaycan dili" dərsliklərinin Respublika Dövlət mükafatına layiq görülməsi, anadilli ədəbiyyatın inkişafı üçün hər cür şəraitin yaradılması, Azərbaycan ədəbiyyatı klassiklərinin təbliği məhz bunun nəticəsi idi". http://www.yap.org.az/az/view/interview/188/

Ömərov bu haqda yazır: "Ulu Öndərin ideyalarının əzmkar davamçısı, Azərbaycan Respublikasının Prezidenti İlham Əliyev bu siyasətin tarixi rolundan bəhs edərkən demişdir: "Azərbaycan rəhbərliyinin apardığı siyasət yeganə düzgün siyasətdir. Bunu həyat da sübut etmişdir. Azərbaycan çox böhranlardan şərəflə çıxmışdır. Vətəndaş müharibəsi və cəmiyyətin parçalanması təhlükəsindən qurtarmışdır. İndi Azərbaycanda sabitlikdir, güclü iqtisadiyyat vardır, demokratikləşdirmə yolunda çox işlər görülür. Buna görə də mən qəti əminəm ki, hazırda yeridilən xətt davam etdirilməlidir... İndiki siyasət bir çox onilliklər üçün nəzərdə tutulmuş siyasət olmalıdır. Əks halda, Azərbaycan yenə də hansısa hərc-mərcliyə məruz qala bilər." Deyilən fikirlərdən də aydın olduğöu kimi Heydər Əliyev siyasətinə, onun Azərbaycançlıq və Azərbaycan dili ideologiyasına olan inam bir irs olaraq İlham Əliyevin fəaliyyətində də biurmənalı şəkildə öz əksini tapır. Bu gün bütün dünyada azərbaycançılığın ən böyük qarantı Azərbaycanın və hər bir azərbaycanlının Prezidenti İlham Əliyevdir". (4)

Dövlət başçısı İlham Əliyevin 2012-ci il 13 mayda imzaladığı "Azərbaycan dilinin qloballaşma şəraitində zamanın tələblərinə uyğun istifadəsinə və ölkədə dilçiliyin inkişafına dair Dövlət Proqramı haqqında" sərəncam ana dilinin inkişafı istiqamətində mühüm addımdır. Azərbaycan dilçiliyinin qarşısında yeni vəzifələr qoyan bu sərəncam dilçiliyin hər sferasını özündə əks etdirir. Xüsusilə, dövlət müstəqilliyi, Azərbaycan dilinin dövlət dili statusu alması, yeni təhsil sisteminin yaradılması prosesində Terminologiya Komissiyasının da vəzifələri daha da artmış (6).

Bütün bunlar nəzərə alınaraq sərəncamda qeyd edilirdi: "Azərbaycan dilində termin yaradıcılığı sahəsində işlərin tənzimlənməsi və koordinasiya edilməsi üçün Azərbaycan Respublikasının Nazirlər Kabineti yanında Terminologiya Komissiyası yaradılsın". Bununla da Terminologiya Komissiyasına yeni hüquqi status verilmişdir. Müstəqillik illərində Azərbaycan dilinin lüğət tərkibində köklü dəyişikliklər baş verir. Bu hər şeydən əvvəl, Azərbaycan dilinin başqa dünya dilləri ilə birbaşa əlaqələri ilə bağlıdır. Ötən dövrdə sərəncamdan irəli gələn vəzifələr həyata keçirilmiş, Nazirlər Kabinetinin 26 noyabr 2012-ci il tarixli 277 nömrəli qərarı ilə Azərbaycan Respublikasının Nazirlər Kabineti yanında Terminologiya Komissiyası yaradılmışdır (6).

"Qloballaşan müasir dünyada Azərbaycan dilinin taleyi, tamamilə təbiidir ki, hər bir azərbaycanlını milli təəssübkeşlik baxımından dərindən düşündürən məsələdir. Dövlət Proqramında "qloballaşma" anlayışının, tamamilə doğru olaraq, geniş izahı, bu barədəki biri digərinə çox zaman zidd olan mülahizələrin icmalı verilməyib, lakin bu mühüm dövlət əhəmiyyətli sənədin meydana çıxmasının tarixi səbəbinin məhz qloballaşma (onun qaçılmazlığı) olması Proqramın, demək olar ki, hər bir müddəasında öz əksini tapmış, nəticə etibarilə, ümumdünya miqyaslı – bütün bəşəriyyəti düşündürən proses-hadisəyə kifayət qədər dərindən münasibət bildirib: Bu gün Azərbaycan dilinin milli dövlətçiliyin başlıca rəmzlərindən olaraq istifadəsi və əsaslı tədqiqi, ölkədə dilçilik elmi sahəsində vəziyyətin yaxşılaşdırılması üçün əlverişli zəmin yaradılıb" www.yap.org.az/az/view/interview/188/

**Nəticə**

Bu gün dünyada 50 milyondan çox Azərbaycan dilində danışan əhali mövcuddur. Bu əhalinin 20 milyondan coxu İran Azərbaycanının payına düşməkdədir. Bununla yanaşı dünyanın bir çox dövlətlərində o cümlədən, Türkiyə, Rusiya, Avropa və Amerikada milyonlarla həmvətənlərimiz yaşamaqdadır. Bu isə Azərbaycan diasporasının və eləcə də Azərbaycan dövlət dilinin inkişafı deməkdir. Dilimzin inkişafı yolunda Ulu Öndər Heydər Əliyevin dil siyasəti irsini Prezidentimiz cənab İlham Əliyev daha da inkişaf etdirərək Azərbycan dilini müasir sivil dünya dövlət dilləri səviyyəsində yüksəldə biulmişdir.

**Ədəbiyyat**

1. Balayev X. Azərbaycan dilinin dövlət dili kimi təşəkkül tarixindən (XVI-XX əsrlər). Bakı. Elm və həyat 2002, 104 s.
2. Hacıyev T. Azərbaycan ədəbi dilinin tarixi, 1-ci hissə, Bakı, Elm, 2012, 495 s.
3. Səfərli Ə., Yusifli X. Azərbaycan ədəbiyyatı tarixi. Bakı, 2008, Ozan nəşriyyatı, 696 s.
4. Ömərov V. Azərbaycançılıq və Azərbaycan dili Səs qəzeti 31 Yanvar 2012 20:36 | 6 350
5. Azərbaycançılıq və Azərbaycan dili Azərbaycan Respublikası Prezidentinin İşlər İdarəsinin Prezident Kitabxanası
6. Sadıqova S. Azərbaycan dilinin saflığının qorunması və təkmilləşdirilməsi zamanın tələbidir. Xalq qəzeti, 7 noyabr, Xəbərlər http://xalqqazeti.com/mobile/az/news/8149
7. Cəfərov N. Azərbaycan dilinin həm ümumxalq dili, həm də dövlət dili kimi inkişafında Ulu öndər Heydər Əliyevin xidmətləri tarixi əhəmiyyət kəsb edir 30 Oktyabr 2015 17:25http://www.yap.org.az/az/view/interview/188/
8. https://nizamimuseum.az/az/news/1595

**Rəyçi: prof. F.Cəlil**

Göndərilib: 20.02.2021 Qəbul edilib: 23.02.2021

DOI: 10.36719/2663-4619/63/55-58

**Gültəkin Əzim qızı Salmanova**
Azərbaycan Memarlıq və İnşaat Universiteti
müəllim
c.gultekin1986@mail.ru

# AZƏRBAYCAN VƏ İNGİLİS DİLLƏRİNDƏ RƏNG BİLDİRƏN SİFƏTLƏRİN MÜQAYİSƏLİ-LİNQVİSTİK TƏHLİLİ

***Açar sözlər:*** *sifətin leksik-semantik sahəsi, semantik və üslubi çalarlar, semantik əlaqələr, leksik omonimlər, hidronimlər*

## Comparative linguistic analysis of color appendices in Azerbaijan and English languages

**Summary**

The study of color-expressing adjectives, one of the lexical-semantic groups of adjectives, based on the materials of different systems of languages, is relevant. Therefore, this article is devoted to the comparative-linguistic analysis of adjectives in Azerbaijani and English. It is stated here that when examining the adjectives denoting color, its set of meanings should be considered in full, and the contexts that explain the meaning should be used. Because adjectives that express color play an important role in determining the semantic features of the object and concept that language calls.

***Key words:*** *lexical-semantic area of the adjective, semantic and stylistic shades, semantic relations, lexical homonyms, hydronyms*

## Giriş

Məqalədə sifətin leksik-semantik qruplarından biri olan rəng bildirən sifətlərdən bəhs olunur. Burada göstərilir ki, rəng adları çox az kateqoriyalarındandır ki, onlar semantik sahələr və lüğətin sistemliyini tədqiq etmək üçün materiallardan hesab olunur. Rəngin leksik-semantik sahəyə aid edilməsinin əsas xüsusiyyətləri bunlardır: 1) ümumi rəng komponentini özündə əks etdirən çoxmənalı sözlər leksik-semantik sahəni təşkil edir; 2) dildə hər bir söz çox məna təşkil etsə belə leksik-semantik sahənin tərkibinə daxil olur.

Qeyd edək ki, Azərbaycan dilində rəng bildirən sifətlərin dörd növünə təsadüf olunur: 1) ixtiyari–motivləşməmiş işarələr; 2) ixtiyari–motivləşmiş işarələr; 3) isimlə motivləşmiş işarələr; 4) sifətlə motivləşmiş işarələr.

İlkin rəng adları. Bunlar aşağıdakılardır: sarı, qırmızı, göy, yaşıl, ağ, boz, qara. Boz termininin ilkin rəng adlarına aid edilməsi qəribə görünə bilər. İlkin rəng adları arasında aşağıdakı semantik əlaqələr özünü göstərir: a) semantik yaxınlıq münasibəti. Bu, göy və yaşıl, sarı və qırmızı sözlərinə aiddir.; b) semantik əkslik münasibəti. Bu isə ağ və qara sözlərinə xasdır. Məsələn: *ağ üstən qaranı yaz. Ağı yaz, qaranı yaz. Qara salxım ağ olmaz* (Bayatı).

İxtiyari-motivləşmiş rəng adları. Bunlar aşağıdakılardır: al – "tünd qırmızı"; ala – "başqa rənglə qarışıq ağ"; qonur – "şabalıdıya yaxın rəng"; qumral – "açıq şabalıdı"; kəhər – "açıq şabalıdı"; kürən – "parıltılı sarı-qırmızı"; səmənd – "açıq sarı"; çal – "tünd boz", "qarışıq boz" və s.

Həmin sifətlərin bir qismi məxsusi obyektlərə aid edilir. Məsələn: *al sözü "şəfəq" və "bayraq", kəhər, kürən və səmənd sözləri isə "at" barəsində işlənir*. İxtiyari-motivləşmiş rəng adlarının bəziləri ilkin rəng adları ilə təkcə semantik izahetmə münasibətində deyil, həm də semantik əkslik münasibətində olur. Həmin semantik əlaqə ala və qara, al və yaşıl sözləri arasında olur. Məsələn: *ala dağa, Gün düşüb ala dağa, Mən qaradağ əhliyəm, Yaz məni Qaradağa; Yaşıl məndən, al səndən. Yar geyinib tamam al. Tamam yaşıl, tamam al. Al-yaşıl gey bizə gəl.* (Bayatı)

Əsas rəng bildirən sifətlərin yaranmasına dair müxtəlif nəzəriyyələr irəli sürülüb. Belə ki, tədqiqatçılar ingilis dilində əsas 11 rəng bildirən sifətin olduğunu göstərirlər: white, black, red, yellow, blue, brown, purple, pink, grey, orange. Azərbaycan dilində isə əsas 11 rəng bildirən sifətlər aşağıdakılardır: ağ, qara, qırmızı, yaşıl, sarı, mavi, qəhvəyi, bənövşəyi, çəhrayı, narıncı, boz. Tədqiqatçılar rəng bildirən sifətlərin semantik inkişaf məsələsinə dair konkret fikirlər söyləmişlər. Onların fikrincə, ilk rəng bildirən sifətlər ağ və qara məfhumları ilə bağlı olmuşdur. Hər iki dildə bir sıra çoxmənalılıq kəsb edən sifətlər var. Məsələn: İngilis və Azərbaycan dillərində "qara" mənalı sifətin semantik təhlilini verək. "Black" sifətinin ingilis dilində 9 müxtəlif mənası qeyd olunur: 1) pis niyyətli mənasında; black reasons – pis niyyətli səbəblər; 2) ləkə və ya biyabırçılıq mənasında; black denomination – ləkəli ad; 3) fəlakətli, dəhşət mənasında; black future – fəlakətli gələcək; 4) çirkli mənasında – a black shoe – çirkli ayaqqabı; 5) qara dərili, yəni irq

mənasında; blacks and whites (qaralar və ağlar); 6) qaranlıq və ya tünd mənasında; a black corridor – qaranlıq dəhliz; 7) qaşqabaqlı mənasında; black look – qaşqabaqlı baxış; 8) depressiya və ya qəmgin mənasında; black mood – qəmgin əhval-ruhiyyə (Oxford Advanced Learner`s dictionary, 2010: 47-50)

Ümumiyyətlə, "Black" sözünün əsas nominativ mənası "qara" sifətidir. Əsas məna hər iki dil üçün eynidir. Qara sözünün hər iki dildə yaratdığı ortaq mənalara nəzər yetirək: a) qaralmış, tutqun, qara: black clouds – qara buludlar; black night – qaranlıq gecə. Qeyd edək ki, Azərbaycan dilində "qara bulud" birləşməsi məcazi mənada da işlənir. Məsələn: *Ölkənin başını qara bulud aldı.* b) qara (dərinin rəngi haqqında): black race–qara irq; black man–qara adam; c) çirkli, kirli mənasında; black hands–qara əllər; black clothes–qara paltarlar; d) dəhşətli, qorxulu mənasında; black moment–ağır, çətin an; black ordeal–qorxulu sınaq; black deed–qorxulu iş. Azərbaycan dilində "qara iş" birləşməsi ağır, çətin, çirkli iş mənalarında işlənir. Onu da deyək ki, Azərbaycan və ingilis dillərində "qara" sözü ilə işlənən bir sıra birləşmələr var ki, məna etibarilə onlar üst-üstə düşürlər: Məsələn: Qara birja (qeyri rəsmi, gizli birja) və black money "çirkli pullar", gizli, qeyri-qanuni gəlir; to be in black (qara geyinmək) və qara geyinmək (yas və matəm rəmzi kimi); a black shirt (qara köynək) və qara əllər (çirkli, kirli mənasında); black flag – qara bayraq (pirat bayrağı); black market – qara bazar.

İngilis və Azərbaycan dillərində hidronimlərin tərkibində də "qara" sözünə təsadüf edilir. Belə ki, ingilis dilində işlənən "black water" birləşməsinin Azərbaycan dilinə hərfi tərcüməsi "qara su" birləşməsidir. Lakin hərfi tərcümə ingilis dilindəki mənanı vermir. Çay, dəniz, göldə dərin yerlərə yuxarıdan baxdıqda su dərin görünür. Bu cəhət əsas götürülərək ingilis dilində "black water" birləşməsi "dərin su" mənasında işlənilir. Hərçənd ki, Azərbaycan dilində dərin çay, dərin göl birləşmələri var ki, bu birləşmələr ingilis dilində "deep" sifəti ilə işlənilir. Azərbaycan dilində hidronimlərin tərkibində "qara" apelyativinin heç də təkcə rəng mənasında işlənmədiyi barədə müxtəlif mübahisələr dilçilikdə öz əksini tapır. bir sıra alimlər (A.Qurbanov, İ.Dron, M.İslamov, Ş.Sədiyev, A.Axundov və s.) hidronimlərin tərkibində "qara" apelyativinin suyun keyfiyyəti ilə əlaqəli olduğunu qeyd edirlər. Məsələn: Qarasu, Qaraçay, Qaragöl və s. bu kimi adlarda "qara" termini suyun içmək üçün yararlı olmadığını göstərir.Yəni burada "qara"sözü rəng deyil, suyun tərkibini bildirir. Böyrəyin çətin süzdüyü və mədədə çöp əmələ gətirən su "qara su"adlanır.

Azərbaycan dilində isə "qara" sözünün yaratdığı 14 əsas məna bunlardır: 1) çirkli, kirli mənasında; qara əllər, qara pərdə; 2) şahmat oyununda qara rəngli fiqurlar mənasında; qaralar məğlub oldu; 3) şahmat oyununda qara fiqurlar oynayan mənasında; qaralar təslim oldu; 4) bir yazının qaralaması, ilk mətni, layihəsi mənasında; məktubun qarası; 5) ağır, pis, kədər doğuran, qorxulu mənasında; ürəyinə qara fikirlər gəldi; 6) cinayətkar, mənfur, fitnəkar mənasında; qara qüvvələr; 7) yas, matəm mənasında; qara bayram, qara geyinmək; 8) qoşulduğu sözlərə mənfilik, məsumluq mənası vermək mənasında; qara qayğı, qara dərd; 9) cəmiyyətin yuxarı siniflərinə mənsub olmayan, istismar olunan, adi, avam adam mənasında; qara camaat; 10) qədim Rusiyada dövlətə məxsus olan, öz xüsusi mülkiyyəti olmayan, dövlətin ixtiyarında olan mənasında; qara kəndlilər; 11) ixtisası olmayan, ixtisas tələb etməyən, ağır işdə işləyən mənasında; qara fəhlə, qara işçi; 12) dəyərsizlik, əhəmiyyətsizlik, heçlik mənasında; qara qəpiyə dəyməz; 13) qeybət etmək mənasında; kiminsə qarasına danışmaq; 14) bəzi bitki və heyvan adlarının tərkib hissəsi kimi; qara darı, qara ayı, qara istiot (Azərbaycan dilinin izahlı lüğəti. III cild, 2006: 87) .

İngilis dilində ağ (white) sözünün ingilis dilində əsas 20 mənasına, Azərbaycan diində isə 8 mənasına təsadüf edilir. Qeyd edək ki, "ağ" sözü ilə yaranan bir sıra birləşmələr var ki, onların mənaları hər iki dildə üst-üstə düşür: 1) Gümüşü mənasında; a white barecelet – gümüşdən hazırlanmış qolbaq; Gümüşdən, yaxud ağ metaldan hazırlanmış pul mənasında – ağ pul (Azərbaycan dilində); 2) Ağ rəngli insan (irq) mənasında; whites – ağlar (ingilis dilində); Ağların sivilizasiyası (Azərbaycan dilində); 3) Şahmat oyununda ağ fiqurlar mənasında; to play white – ağ fiqurlarla oynamaq (ingilis dilində); Ağlar qalib gəldi (Azərbaycan dili); 4) Təmiz mənasında; a white wall (ingilis dili); ağ kağız (Azərbaycan dili)

Ümumiyyətlə isə ingilis dilində "Ağ" sözünün əsas 20 mənasına təsadüf olunur və bunlar aşağıdakılardan ibarətdir: 1) rəngsiz mənasında; a white room – rəngsiz otaq (hərfən ağ otaq); 2) günahsız mənasında; white hands – günahsız əllər (hərfən ağ əllər); 3) xoşbəxt, uğurlu mənasında; white days – ağ günlər; 4) sadə musiqi mənasında; a white song – sadə mahnı (hərfən ağ mahnı); 5) süd rəngi mənasında; white cows – ağ inəklər; 6) ağ geyim mənasında; to be in white – ağ geyinmək; 7) gözün ağı mənasında; the white part of the eyeball – gözün ağ hissəsi; 8) cəm halda, yəni white sözünün sonuna –s şəkilçisi əlavə olunmaqla un məmulatları mənasında; whites – un məmulatları; 9) irticaçı, mürtəce siyasət tərəfdarı mənasında; white terror – ağ terror; 10) rəngi solğun mənasında; white-faced pupils – rəngi solmuş şagirdlər; 11) qarlı mənasında; white streets of the city – şəhərin qarlı küçələri; 12) Amerika prezidentinin hakimiyyətdə olduqları dövrdə yaşadığı ev mənasında; the white House – Ağ ev; 13) qəhvə kimi içkilərə süd əlavə olunduqda işlənir; a cup of white coffee – süd əlavə olunmuş qəhvə (hərfən ağ qəhvə); 14) gümüşü

mənasında; a white earring – gümüşdən hazırlanmış sırğa (hərfən ağ sırğa); 15) ehtiraslı, coşqun mənasında; white fury – coşqun qəzəb (hərfən ağ qəzəb); 16) ağ rəngli insan, yəni irq mənasında; whites – ağlar; 17) yumurtanın ağı mənasında; yolk and white – sarı və ağ (yumurta); 18) şahmat oyununda ağ fiqurlar mənasında; to play white – ağ fiqurlarla oynamaq; 19) təmiz mənasında; a white window – təmiz pəncərə (hərfən ağ pəncərə); 20) açıq işıq mənasında; white rooms – işıqlı otaqlar (hərfən ağ otaqlar) (Oxford Advanced Learner`s dictionary, 2010: 121-127).

Qeyd edək ki, həm ingilis, həm də Azərbaycan dilində "ağ yalan" ifadəsinə rast gəlinir. Lakin onlar arasında müəyyən məna fərqləri özünü göstərir. Azərbaycan dilində "ağ yalan" – təmiz, açıq-aydın görünən yalan olduğu halda, ingilis dilində "white lie" – nəzakətli olmaq və ya digərinin məyusluq, qanqaralığa son qoymaq məqsədilə deyilən yalan mənasını bildirir.

Qırmızı sözü həm ingilis, həm də Azərbaycan dilində 5 məna yaratmağa xidmət etməsinə baxmayaraq, onların ifadə etdikləri mənalar heç də üst-üstə düşmür. Belə ki, ingilis dilində qırmızı sözünün yaratdığı mənalar aşağıdakılardır: 1) inqilabçı mənasında; The red`s victory – inqilabçının qələbəsi; 2) sağlam mənasında; red-blooded – sağlam; 3) dəmir pul mənasında; red cent – xırda, dəmir pul; 4) Amerika İnqilabı və 1812-ci ildə müharibə dövründə Britaniya əsgəri mənasında; red-coat; 5) yetişmiş mənasında; a red-ripe apple – yetişmiş alma. Azərbaycan dilində isə qırmızı sözü ingilis dilindən fərqli olaraq tamamilə fərqli mənalar yaratmağa xidmət edir: 1) gözəllik, parlaqlıq, aydınlıq mənasında; qırmızı bahar; 2) qızıl mənasında; qırmızı üzük; 3) nəzakətsizlik dərəcəsində olan açıq mənasında; qırmızı adam, qırmızı danışan (açıq danışan, sözü üzə deyən); 4) sosializm quruluşu, sovet sosialist üsul idarəsi ilə əlaqədar olan mənasında; qırmızı qvardiya, qırmızılar; 5) bəzi mürəkkəb terminilərin I tərkib hissəsi; qırmızı turp, qırmızı şüalar (Azərbaycan dilinin izahlı lüğəti, III cild, 2006: 105).

Qeyd edək ki, Azərbaycan dilində nəzakətsizlik mənasını bildirərkən təkcə qırmızı yox, bəzi hallarda boz sözündən də istifadə olunur. Belə ki, Azərbaycan dilində boz sözü 3 məna yaratmağa xidmət edir: 1) sərt, qaba danışan, nəzakətsiz mənasında; boz qonşu; 2) tutqun, dumanlı, çiskin mənasında; boz hava; 3) bitkisiz, çılpaq mənasında; boz çəmən, boz sahə və s. (Azərbaycan dilinin izahlı lüğəti. III cild, 2006 : 72).

Həm ingilis, həm də Azərbaycan dilində sarı sözü rəng bildirməkdən əlavə, daha 3 mənanı yaratmağa xidmət edir. Belə ki, ingilis dilində sarı sifətinin yaratdığı mənalar bunlardır: 1) yumurtanın sarısı; yellow and white – sarı və ağ (yumurta); 2) bitki xəstəlikləri mənasında; plants with yellow – xəstə bitkilər; 3) qorxaq mənasında; a real man musn`t be yellow – əsl kişi qorxaq olmamalıdır. Azərbaycan dilində isə ingilis dilindən fərqli olaraq sarı sözü aşağıdakı mənaları yaratmağa xidmət edir: 1) ruhi xəstələr üçün ev mənasında; sarı ev; 2) qızıl mənasında; sarı taxmaq; 3) müxtəlif mürəkkəb sifətlərin, terminlərin I tərkib hissəsi kimi; sarı yarpaq, sarı acıotu (Azərbaycan dilinin izahlı lüğəti. III cild, 2006:112), (Oxford Advanced Learner`s dictionary, 2010: 108).

Yaşıl sözü də həm ingilis, həm də Azərbaycan dilində müxtəlif mənalar yaratmağa xidmət edir. Belə ki, yaşıl sözünün ingilis dilində 10 əsas mənasına, Azərbaycan dilində isə 4 əsas mənasına təsadüf olunur. Bu mənalar içərisində yalnız 3 məna var ki, hər iki dildə üst-üstə düşür: 1) hər iki dildə yaşıl sözü kal, yetişməmiş mənasını bildirir. Məsələn: Azərbaycan dilində yaşıl (yetişməmiş) alma; İngilis dilində; green pears – yetişməmiş armud; 2) hər iki dildə yaşıl sözü təbiəti qoruyanlar təşkilatı mənasını yaratmağa xidmət edir. Məsələn: İngilis dilində: The green Party–Təbiəti Qoruyanlar Partiyası; Azərbaycan dilində: Yaşıllar hərəkatı (Təbiəti qoruyanlar təşkilatı); 3) hər iki dildə yaşıl sözü rəng mənasını bildirir: Məsələn: İngilis dilində green pen (yaşıl qələm); Azərbaycan dilində: yaşıl don (Azərbaycan dilinin izahlı lüğəti. III cild, 2006: 88-90), (Oxford Advanced Learner`s dictionary, 2010: 134-137). Lakin bu, o demək deyil ki, yaşıl sözü hər iki dildə heç də müxtəlif mənalar yarada bilmir. Belə ki, ingilis dilində yaşıl sözü yuxarıda qeyd etdiklərimizlə yanaşı, aşağıdakı mənaları da ifadə edə bilir: 1) budaq və ya yarpaq mənasında; the greens of trees – ağacların yarpaqları; 2) çəmən mənasında; the green of our yard – həyətimizin çəmənləri; 3) təzə mənasında; green shoes – təzə ayaqqabı; 4) hər kəsə inanan mənasında; a green old woman – hər kəsə inanan yaşlı qadın; 5) təcrübəsiz mənasında; a green report – səriştəsiz hesabat; 6) ağıldan seyrək və sadəlövh mənasında; green teenagers – sadəlövh yeniyetmələr; 7) mülayim mənasında (iqlim mənasında); a green climate – mülayim iqlim; 8) gəncliyə xas olan mənasında; a green act – düşünülməmiş hərəkət. Azərbaycan dilində isə yaşıl sözünün ingilis dili ilə ortaq mənalarından əlavə, aşağıdakı mənanı da yaratmasının şahidi oluruq. Belə ki, Azərbaycan dilində yaşıl sözü "İslam dininin simvolu" mənasını da yaratmağa xidmət edir (Azərbaycan dilinin izahlı lüğəti. III cild, 2006: 87-93), (Oxford Advanced Learner`s dictionary, 2010: 128-135).

Maraqlıdır ki, Azərbaycan dilində qəhvəyi sözü yalnız rəng mənası yaratsa da (qəhvəyi paltar), ingilis dilində bu söz 4 məna yaratmağa xidmət edir: 1) yaltaq mənasında; a brown-nose neighbour – yaltaq qonşu; 2) varlı, imkanlı mənasında; a brownstone–varlı; 3) qara unla bişirilmiş çörək mənasında; brown bread – qara çörək; 4)

günəşin altında qaralmaq mənasında; to brown on the beach–dənizin sahilində qaralamaq (Azərbaycan dilinin izahlı lüğəti. II cild, 2006: 148-152), (Oxford Advanced Learner`s dictionary, 2010: 157).

Qeyd edək ki, digər əsas rənglərdən fərqli olaraq, narıncı (orange), qəhvəyi (brown), çəhrayı (pink), bənövşəyi (purple) rəngləri həm Azərbaycan, həm də ingilis dillərində yalnız bir məna, yəni rəng mənası yaratmağa xidmət edir.

## Nəticə

Nəticə etibarilə onu deyə bilərik ki, rəng bildirən sifətlərin bir-birini əvəz etməsinə baxmayaraq, onların arasındakı məna çalarlığı tam əvəzlənmə yarada bilmir. Çünki rəng bildirən sözlər leksik omonimlər kimi bir-birindən əlavə semantik və üslubi çalarlara görə fərqlənirlər. Tədqiqatçıların bir qismi belə hesab edir ki, dilimizin qədim dövrlərində ağ və qara sözləri "qısa" və "uzun" semantik çalarlarına da malik olmuşlar. Yani ağ sözündən qısalıq, qara sözündən isə uzunluq ölçü vahidini bildirən söz kimi istifadə etmişlər. Qeyd edək ki, bu tipli mənalar bir sıra toponimlərin, xüsusilə çay adlarının tərkibində indiyənədək saxlanmışdı.

## Ədəbiyyat

1. Abdullayev Ə.Z., Seyidov Y.M., Həsənov A.Q. Müasir Azərbaycan dili. Bakı, Maarif, 1972. 476 s.
2. Azərbaycan dilinin antonimlər lüğəti. Bakı, Şərq-Qərb, 2007, 144 s.
3. Azərbaycanca – ingiliscə lüğət. Bakı, AZƏRNƏŞR, 1999, 408 s.
4. Azərbaycan dilinin izahlı lüğəti. I cild. Bakı, Şərq-Qərb, 2006, 744 s.
5. Azərbaycan dilinin izahlı lüğəti. II cild. Bakı, Şərq-Qərb, 2006, 792 s.
6. Azərbaycan dilinin izahlı lüğəti. III cild. Bakı, Şərq-Qərb, 2006, 672 s.
7. Койчубаев Е. Нецветовая сущность топономических компонентов ак, кара, сары. Всесоюзная конференция по топонимике. 1968, с. 183-189
8. Oxford Advanced Learner`s dictionary. London, Oxford University press, 2010, 1796 p.

**Rəyçi: dos. A.Məmmədova**

Göndərilib: 08.02.2021 Qəbul edilib: 11.02.2021

DOI: 10.36719/2663-4619/63/59-63

**Emil Eyyub oğlu Cavadov**
DTX-nin Heydər Əliyev adına Akademiyası
emilgts@mail.ru

# KRİMİNALİSTİK DİAQNOSTİKANIN ƏSASLARI

***Açar sözlər:*** *kriminalistika, diaqnostika, məhkəmə, ekspertiza, identifikasiya*

## Fundamentals of criminal diagnosis

**Summary**

The great interest of criminologists in diagnostic problems is due to the fact that diagnostics plays a special role in the evidentiary process both in criminal and civil cases. Forensic diagnostics has already become a scientific method for determining objective truth in criminal and civil cases, proving the presence or absence of certain facts. In investigative and judicial practice, investigative actions are often carried out in connection with the identification of objects. For example, identification of a person, corpse, or object. Most of them are forensic medical examinations related to identification.

Forensic experts conduct identification and give critical opinions in a criminal case to solve a crime and identify the culprit.

Forensic diagnostics training is of general theoretical importance for forensic medicine. At the same time, it is of great importance for the evidence-based theory of criminal justice. Forensic diagnostics finds its practical application at all stages of the investigation, that is, it is necessary and widely used at all stages of the collection of evidence.

***Key words:*** *Forensics, diagnostics, forensic science, expertise, identification*

Kriminalistik diaqnostika konsepsiyası ilk dəfə V.A.Snetkov tərəfindən 70-ci illərin əvvəllərində tətbiq edilmişdir. "Diaqnostika" termini yunan mənşəlidir, müəyyən etmək, tanımaq mənasını ifadə edir və müəyyən hadisələri xarakterizə edən əlamətlər haqqında təlimdir. Bu sözün geniş mənasında istifadəsi elm və texnikanın bütün sahələrində istifadə olunur. Diaqnostika materiyanın tərkib elementlərindən biri olaraq, yeni hadisələrin, proseslərin eyni zamanda maddələrin, materialların, obyektlərin və.s spesifik xüsusiyyətlərin müəyyənləşdirilməsinə imkan verir. Fəlsəfi və məntiqi baxımdan "diaqnostika" ifadəsi haqlı olaraq istənilən hər hansı bir elm sahəsində istifadə edilə bilər (5, 45).

Kriminalistik diaqnostikasının mahiyyəti, məhkəmə obyektlərinin mahiyyəti və məhkəmə obyektlərinin xüsusiyyətləri ilə tanınmasını tənzimləyən qanunların doktrinası kimi müəyyən edilə bilər (şəxsin əl yazısı ilə cinsi, odlu silahdan istifadə izlərinə atəş məsafəsi, şəxsin ayaq izlərində böyüməsi, atış xüsusiyyətləri, odlu silahlarda patronlardakı izlər, tək liflərin tərkibinə və xüsusiyyətlərinə görə geyim növü, yaxılmış tər izlərinə əsaslanan qan qruplarına dair qeydlərin yaşı və.s).

Kriminalistik diaqnostika obyektlərin vəziyyətini tanıyır, hadisələri və prosesləri öyrənir. Beləliklə, ayaq izləri ilə bir insanı yalnız tanımaqla yanaşı, hərəkət istiqamətini, təxmini sürətini, çəki süründürmə faktını və qaranlıqda hərəkətini qiymətləndirmək olar.

Kriminalistik diaqnostika artıq məlum olanlara müəyyən bir bənzər yaratmaq deməkdir. Məhkəmə ekspertizasında bu, öyrənilən vəziyyətlərin müəyyən bir tipik modellə (tipik vəziyyət) oxşarlığının təsbit edilməsidir. Fərq etmək, fərqləndirmək, bu vəziyyəti onun kimi olanlardan ayırmaq deməkdir. Məsələn, tibbdə qurulmuş xəstəliyin tipik forması oxşar simptomları olan digər formalardan ayrıldıqda diferensial diaqnoz konsepsiyası mövcuddur. Nəhayət, (diaqnozun son mərhələsi) müəyyənləşdirmək tipik modellə bənzərlik deməkdir ki, tədqiq olunan şəxsin tədqiq olunan vəziyyətə xas olan bir-birinə xas olduğunu aşkar etmək məqsədi daşıyır.

Bunu nəzərə alaraq, kriminalistik diaqnostikasının ümumi vəzifəsi bir obyektin (fenomenin) xüsusiyyətləri və vəziyyətlərini öyrənmək və izah etməklə obyektiv həqiqətin təsis edilməsi (tərifi, açıqlanması) kimi şərh olunur. Buna görə də kriminalistik diaqnostika, hadisənin (fenomenin, faktın) nəticələrinə görə tərifinə əsaslanan idrak prosesi kimi tərif edilə bilər. Məhkəmədə mürəkkəb bir sübutetmə sistemindəki metodlardan biri olaraq kriminalistik diaqnoz həqiqəti təsbit etmə prinsiplərinə tamamilə uyğundur. Koqnitiv cəhətdən məhkəmə dəlilləri keçmiş hadisələrin zehni olaraq yenidən qurulması kimi qiymətləndirilir və bu müddətdə əks istiqamətdə çıxarılan nəticələr üstünlük təşkil edir: fenomendən mahiyyətinə, təsiretmə səbəbinə, analiz edilən obyektin xüsusiyyətləri və vəziyyətinə əsasən və.s. Bu cür idrak prosesinin metodoloji əsasını əks etmə nəzəriyyəsi təşkil edir.

mütənasibdirsə, dərsdə kompüterə verilən informasiyalar üzərində daha asan işləyəcək, özünü səmərəli şəkildə inkişaf etdirəcəkdir. Kiçikyaşlı məktəblilərin kompüterə emosional münasibəti zəiflətmək onun rolunu düzgün qiymətləndirmək üçün geniş dünyagörüşü olan şagirdlərlə iş aparmaq daha asan olur.

Göründüyü kimi, kiçikyaşlı məktəblilərin təlim fəaliyyətində istifadə edilən kompüter texnologiyalarının onların təfəkürünün inkişafındakı rolunu əsaslandırmaq üçün faktlar yetərincədir. Yalnız sonuncu mülahizədən bir necə məsələ ortaya çıxır:

1) ibtidai siniflərdən başlayaraq onun köməyi ilə kiçikyaşlı məktəblilərdə dünya və onun gerçəklikləri haqqında təsəvvürlər zənginləşdirilir;

2) müstəqil təhliletmə bacarıqlarına yiyələnirlər;

3) təsəvvürlər və təhliletmə təcrübəsi sayəsində kiçikyaşlı məktəblilər istənilən mövzu üzrə təlim materialları əsasında araşdırmalar aparmağı bacarırılar;

4) bu zəmində kiçikyaşlı məktəblilərdə analitik təfəkkür formalaşır.

Göstərilən cəhətlər nəzərə alınaraq təfəkkürün bu xüsusiyyətlərini kompüter texnologiyalarının köməyi ilə möhkəmləndirərək kiçikyaşlı məktəbliləri “kəşf yolu ilə öyrənməyə” istiqamətləndirmək lazımdır (Əlizadə, 2006: 345). Bu heç də kiçikyaşlı məktəblilərin təlim fəaliyyətinin tamamilə mövzular əsasında qurulması ilə yanaşı, təlim prosesinin özünün də yeni tərzdə təşkili, yeni vasitələrin tətbiqi, verilən tapşırıqlara tamamilə yeni elementlərin, qaydaların əlavə edilməsi anlamına gəlmir. Məhsuldar nəticələr əldə etməkdən ötrü birinci növbədə kiçikyaşlı məktəblilərə verilən təlim tapşırıqların keçmiş təcrübə ilə əlaqəsi təmin edilməli, lakin tərkibinə yeni elementlər əlavə olunmalıdır. E.Quliyev (1995: 284) qeyd etmişdir ki, əlverişli şərait yaradıldıqda, hətta biirnci-ikinci sinif şagirdləri idrak obyektlərinin mahiyyətini nalaya bilir, oradan müəyyən nəticə çıxarmağa, səhvləri, uğursuzluqları tapmağa, onları törədən səbəblər barədə müəyyən mülahizələr söyləməyə qabil olurlar”

Bu göstərici yaş imkanlarına görə artıq kiçikyaşlı məktəblinin şəxsiyyətinin yüksək səviyyəsini ifadə edir. Belə şagirdlərdə özünütəhlil, özünütənqid özünütəşkiletmə və özünənəzarət formalaşmış olur. Onlar təlim resurlarından, o cümlədən kompüter texnologiyalarından məharətlə yararlanaraq özünüinkişafa can atırlar. Kiçikyaşlı məktəblilərin təliminin inkişafetdirici mahiyyəti təlim subyektləri olan müəllim - şagird münasibətlərinin xarakterindən də asılıdır. Bu prosesdə müəllim nəzarətedici tərəf olmaqla şagirdin təlim materialları ilə tanışlığına, onların mənimsəməsinə, nəhayət özünütərbiyəsinə nəzarət edir, nizamlayır, nəticələri qiymətləndirir. Şagird isə icraedici funksiyanı yerinə yetirir. Müəllimin nəzarəti altında, onun tətbiq etdiyi metod, üsul və vasitələrin təsiri ilə öyrənməyə səy göstərir: verilən bilikləri mənimsəyir, vərdiş və bacarıqlarını inkişaf etdirir, bir sözlə özünü təkmilləşdirir. Burada bir daha aydın oldu ki, təlimin səmərəliliyi həm də onun əhatəliliyi, yeni məlumatların çatdırılması ilə izah olunur. Ona görə də təlimin təşkilində bir sıra sahələrin əlaqəli izahı, həmin sahələrlə bağlı plan obrazların, təəssüratların yenidən canlandırılması lazım gəlir.

- sosial həyat hadisələrilə bağlı müxtəlif situasiyaların müşahidəsi və təhlili;
- əşya və hadisələr arasında əlaqənin yaradılması;
- şeylərin müxtəlifliyi, hadisələrin dəyişməsi, inkişafı, mahiyyətilə tanışlıq;
- əşya və hadisələr arasında məkan-zaman münasibətlərinin yaradılması;
- əyani modelləşdirmə bacarığının inkişafı;
- obyektlərin sxematik təsviri və planlaşdırma;
- problem-situasiyaların həlli şərtinin yaradılması;
- təbiət materialları ilə praktik fəaliyyət;
- didaktik oyunlar, kompüter oyunları.

Aparılan tədqiqatlarda müəyyən olunduğu kimi, ibtidai siniflərdə təlim prosesində köməkçi texnologiyalardan istifadə olunması kiçikyaşlı məktəblilərdə özünüdərketməyə, mənimsəmənin inkişafına, dünyagörüşünün formalaşmasına, texnoloji vasitələrlə işləmə bacarıqlarının formalaşmasına müsbət təsir göstərir.

## Ədəbiyyat

1. Пласкина М.В. Понятие «технология обечения» в современном педагогике // Педагогики: традиции и инновации: материалы Междунар. науч. конф. Челябинск: Два комсомольца, 2014.
2. Божович Л. И. Личность и ее формирование в детском возрасте. СПб.: Питер, 2009.
3. Quliyev E.M. Kiçikyaşlı məktəblilərdə idrak fəaliyyətinin inkişaf xüsusiyyətləri. Bakı: ADPU-nun mətbəəsi, 1995.

**Rəyçi: dos.N.Rzayeva**

Göndərilib: 04.02.2021 Qəbul edilib: 08.02.2021

DOI: 10.36719/2663-4619/63/84-87

**Ramilə İbrahim qızı Cəfərli**
AMEA Şərqşünaslıq İnstitutu
doktorant
jafarliramila@gmail.com

# AVROPA İTTİFAQININ MİLLƏTLƏRLƏ ƏMƏKDAŞLIQ MEXANİZMLƏRİ: İQTİSADİYYATDAN SİYASƏTƏ DOĞRU

***Açar sözlər***: *Avropa İttifaqı, Cənubi Qafqaz, Mərkəzi Asiya, əməkdaşlıq mexanizmləri, iqtisadiyyat və siyasət*

**Mechanisms for Cooperation of the European Union**
**Summary**

The article deals with mechanisms for cooperation of the European Union with nations considered from the scientific point of' view. The author analyzes the details of the European Union technical assistance program for CIS couintries, its aims and positions in the frame of TACIS.

Each candidate country that intends to get European Union membership has to follow the common principle and standards. But sometimes in addition to the membership obligations EU member states attitude to the candidate countries may playe great role to get the final result. The article analyzes different European countries attitude to Turkey’s membership as one of the barriers that Turkey faces in the frame of Turkey integration policy to EU.

This is explained by the complexity of project co-ordination between the countries in the region, and the economic and political systems in transition countries.

Thus, the desire of the commission to use the TACIS program as a tool for regional co-operation and the settlement of existing conflicts corresponds to the existing reality. İn this context, the Nagorno-Karabakh region of Azerbaijan is a clear example of TACIS programs. The expansion of the Armenian TACIS program to Nagorno-Karabakh has been denied by the European Union as it has no consensus by the Azerbaijani government.
***Key words:*** *European Union, South Caucasus, Central Asia, cooperation mechanisms, economy, politics*

## Giriş

Avropa İttifaqı Cənubi Qafqaz və Mərkəzi Asiya regionları ilə münasibətdə iki əsas alətdən istifadə edir. Bunlardan ən vacibi MDB dövlətlərinə texniki yardım proqramıdır yəni (TACİS). Bu proqram çərçivəsində regionun dövlətlərinə ikitərəfli və regional səviyyədə bütün iqtisadi yardımlar göstərilir.

Bu ikitərəfli partnyorluq və əməkdaşlıq sazişidir ki, burada da məqsəd iqtisadi yardımın göstərilməsi ilə hüquqi və siyasi çərçivələrin yaradılmasıdır.

Region ölkələri ilə əməkdaşlıq edən Aİ-nin əsas proqramı TACİS proqramıdır (Technical Assistance for the Common we-alth of Independent States). Bu proqram 1991-ci ilin iyulunda Aİ Nazirlər Kabinetinin “Avropa İttifaqının SSRİ respublikalarına yardımı Proqramı” kimi təsdiq edilmişdir. Sovet İttifaqının dağılmasından sonra bu proqramın adı dəyişdirilmişdir. TACİS-in əsas məqsədi keçmiş ittifaq respublikalarına maliyyə və texniki yardımın edilməsi, partnyorluq və əməkdaşlıq sazişində təməli qoyulmuş mühüm vasitə kimi nəzərdən keçirilir.

## Avropa İttifaqının əməkdaşlıq mexanizmləri

Postsovet məkanında yeni müstəqil dövlətlər üçün texniki yardımın ilk çərçivəsi 1991-ci ilin iyulunda qəbul edilmişdir.

Скляров Л (1996: 120) Komissiya səviyyəsində qeyd edildiyi kimi, TACİS proqramı Avropa İttifaqının yeni müstəqil dövlətlər ilə daha sıx iqtisadi və siyasi əlaqələrin qurulması üçün yaradılmış vasitələrdən biridir. Bu proqramın işinin yerinə yetirilməsi partnyorluq və əməkdaşlıq sazişi konsepsiyasında öz əksini tapmış, Aİ və yeni müstəqil dövlətlər ilə münasibətlərin genişlənməsi və dərinləşməsi kontekstində yerinə yetirilir və hər iki tərəfin siyasi, iqtisadi və mədəni dialoqun səviyyəsinə çatdırılmasına xidmət edir.

Buna baxmayaraq, Şurada 1996-cı ildən 1999-cu ilədək reallaşdırılmış proqramda sıx iqtisadi və siyasi əlaqələrin yaradılması barəsində heç nə deyilmir. Beləliklə, komissiyanın iqtisadi yardımı xarici siyasətin vasitəsi kimi istifadə etmək niyyətini Şura tərəfindən formal surətdə olsa da qarşısı alınmışdır.

1999-cu ildə Şərqi Avropa və Mərkəzi Asiya partnyorlarına yardım göstərilməsi barəsində yeni direktiv qəbul edilmişdir və 21 yanvar 2000-ci ildə qüvvəyə minərək qarşıdakı yeddi il üçün yardımın çərçivəsini müəyyənləşdirmişdir (2000-ci ildən 2006-cı ilədək).

Yeni direktiv bir sıra yeniliklərə malikdir:

- partnyorluq və əməkdaşlıq sazişləri ilə münasibət;
- əsas sahələr arasında problemlərin dar çərçivədə konsentrasiyası;
- nüvə təhlükəsizliyi problemlərinə diqqətlə yanaşma;

Aİ və partnyor dövlətlərin siyasi institutlarının və sənaye əməkdaşlığının qarşılıqlı əlaqələri kimi müvafiq vasitələr vasitəsilə uzunmüddətli əməkdaşlığın inkişafı tədqiqatda INOGEYT və TRASECA daha çox maraq doğuran proqramlardır.

Əvvəlcədən Avropa Komissiyası ilkin proqramı (indicative programme) hazırlayır, ölkədən asılı olaraq milli ekspert və məmurlarla əməkdaşlıq etməklə, fəaliyyətin məqsəd və strategiyasını müəyyənləşdirir. Sonuncu belə proqram 2000-2006-cı il dövrünü əhatə etmişdir. Bunun əsasında bir ildən iki ilə qədər müddət üçün fəaliyyət proqramı hazırlanır. Buraya texniki əməkdaşlığın həm milli, həm də regional proqramları daxil edilir. Daha sonra fəaliyyət proqramı Avropa İttifaqına üzv dövlətlərin, texniki yardım proqramları ilə işləyən milli xarici işlər nazirliyi departamentlərinin nümayəndələrindən ibarət olan idarəetmə komitəsi olan TACİS-ə verilir.

Maliyyələşdirmə layihəsi TACİS Komitəsi və Komissiyası tərəfindən bəyənildikdən sonra proqram işə başlayır. Milli və ümum avropa səviyyələrində ixtisaslaşmış müəssisələrin ekspertləri üçün tender açılır, sonradan isə Avropa Komissiyası ilə müqavilə bağlanılır. Adətən, müqavilələr aşağıdakı mütəxəssislər tərəfindən təklif edilir: dövlət orqanları (hökumət, milli inzibatçılıq, yerli və ya regional inzibatçılıq), qeyri - kommersiya təşkilatları (EİB, universitetlər, fondlar, texniki və ya tədqiqat institutları, peşəkar assosiasiyalar);

Benefisiant dövlətlərdə komissiyanın nümayəndəlikləri layihənin reallaşdırılmasına nəzarət edir.

Beləliklə, üzv dövlətlər TACİS proqramı çərçivəsində qərarların qəbul edilməsi prosesində TACİS Komitəsi səviyyəsində iştirak edirlər. Belə vəziyyətdə yekun qətnamə və son imza hüququ yalnız komissiyaya aiddir. Aİ-nin Komissiyası xarici iqtisadi yardım vasitəsindən istifadə edərək müstəqil amil olaraq ümum avropa xarici siyasətinin formalaşması mərhələsində sərbəst rol oynamaq iqtidarındadır. Komissiya TACİS proqramının işlənməsi və reallaşdırılması prosesində özü üçün layihələrin müstəqil idarə edilməsi və müşahidə edilməsi məqsədi ilə diplomatik müstəqillik əldə etmişdir.

Хлопов О.А (2001: 247) Proqram öz qarşısına iki vacib məqsəd qoyur: iqtisadi inkişafı dəstəkləmək və bazar iqtisadiyyatının yaradılması, həmçinin hüquqi dövlətin yaradılması və insan hüquqları və demokratiya.

Qoyulmuş məqsədlərə çatmaq məqsədi ilə iqtisadi qarşılıqlı təsir vasitələrindən və ilk növbədə (kommersiya sirri patentlə qorunmayan məlumatlar) ekspert köməyinin ötürülməsidir ki, bunun sayəsində dövlət müəssisələrinin destrukturlaşdırılması və sahibkarlıq sektorunun inkişafına yardım etmək;

yeyinti məhsullarının istehsal və paylanılması imkanının yaradılması;

enerji, telekommunikasiya və nəqliyyat infrastrukturunun yaradılması;

dövlət idarəçiliyinin və sosial xidmətlərin islahatının aparılması.

TACİS proqramı çərçivəsində milli fəaliyyət proqramları və regional proqramlar işlənilir. Regional proqramlara TACİS büdcəsinin təxminən 30 %-i sərf edilir. Hər bir milli proqrama TACİS proqramının dövlət büdcə proqramı (TACİS büdcəsinin 55 %) və kiçik layihələr proqramı daxildir (büdcənin 15 %).

Kiçik layihələr proqramı məqsədli və çevik layihələrdən ibarət olmaqla, tez tətbiq edilir və vəsait müvafiq ölkənin milli fəaliyyət proqramından ödənilir. Onlar beş fəaliyyət sahəsini əhatə edir: siyasi məsləhətləşmə, vətəndaş cəmiyyəti, təhsil, sənayenin dəstəklənməsi, beynəlxalq standartlar və öhdəliklər.

Regional proqramlar hər hansı bir dövlətə istiqamətlənməmişdir, o, milli fəaliyyət proqramları ilə yanaşı yerinə yetirilir. Belə proqramlara transsərhəd əməkdaşlığı və nüvə təhlükəsizliyi proqramlar aiddir. Hazırda əsas fərq ondan ibarətdir ki, əvvəllər TACİS proqramı birinci tələbat sorğularına əsaslanırdısa, indi o, daha çox Aİ-nin regiondakı siyasi məqsədlərinə yönəlmişdir. TACİS-in ümumi strategiyasında müəyyənləşdirilmiş prioritetlər, sonradan regiona ezamiyyətlər zamanı yenidən işlənir. Məzmun nə qədər material cəhətdən azdırsa, mexanizm bir o qədər özünü kifayət etdirəcəkdir.

Beləliklə reallıqla əlaqədar olan humanitar yardım proqramları texniki kömək və «nou-hau»-nun ötürülməsindən fərqlənir. Sonuncular çox vaxt müəllif və alıcı dövlətlərin həqiqi praktiki və siyasi məsələlərin faydasından uzaq olan icraçılar arasında sərt diskussiyalara səbəb olur. Paradoksaldır ki, komissiyanın işləməsinin mühafizəkarlığı bürokratik strukturun ətalətliyi ilə əlaqədar deyildir. Səbəb kadrların daim dəyişdirilməsi və fasiləsiz islahatmadadır ki, bu da institusional yaddaşı, işlərin

standartlaşdırma metodları ilə əvəz edilməsidir. Belə inzibatçı mühafizəkarlıq həm Aİ-də, həm də yardım alan ölkələrdə tənqidin əsas səbəbi olmuşdur.

Avropa İttifaqının Azərbaycana yardımları 1991-2006-cı illədək MDB ölkələrinə texniki əməkdaşlıq (TACİS) proqramı çərçivəsində həyata keçirilmişdir. Bu proqram institusional, hüquqi və inzibati islahatların aparılması, bazar iqtisadiyyatına keçid dövrünün sosial nəticələrinin aradan qaldırılması, yoxsulluğun minimuma endirilməsi məqsədlərinə yönəldilmişdir. Aİ yardımları növbəti illərdə Avropa Qonşuluq və Tərəfdaşlıq Aləti (ENPI) vasitəsilə həyata keçirilməyə başlanılmışdır. Azərbaycan üzrə Strateji Maliyyələşmə Sənədi Aİ-nın ENPI çərçivəsində maliyyə yardımı paketini 2007-2013-cü illərdə ehtiva etmişdir. Bu Milli İndikativ Proqramla müşayiət olunmuşdur. Aİ-nın Azərbaycana 2007-2015-ci illərdə ayırdığı ikitərəfli yardımın həcmi 179 milyon avro olmuşdur.

Avropa Komissiyasının sabiq prezidenti Xose Manuel Barrozu və Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev Bakı şəhərində 2011-ci ildə Cənub Qaz Dəhlizi üzrə Birgə Bəyannamə imzalamışdır. Cənub Qaz Dəhlizi Xəzər dənizi, Mərkəzi Asiya və Orta Şərq qaz resurslarını Avropa bazarına gətirə biləcək və Aİ – nın enerji təhlükəsizliyinin şaxələndirilməsində rol oynaya biləcək strateji təşəbbüsdür. Şah Dəniz-2 yatağından, Xəzər hövzəsindən təbii qazın nəqlini nəzərdə tutan Cənub Qaz Dəhlizinin infrastrukturu Cənubi Qafqaz boru kəmərinin genişləndirilməsi, Trans – Anadolu və Trans – Adriatik boru xəttinin inşasını əhatə edir. Nəticədə Azərbaycan qazı Gürcüstan və Türkiyə üzərindən Bolqarıstan, Yunanıstan və İtaliyaya çatdırılacaqdır. Şah Dəniz – 2 yatağı ilkin olaraq Türkiyəyə 6 milyard kub metr Avropa ölkələrinə isə 10 milyard kub metr qaz nəql edəcəkdi.

2014-2020-ci illərdə Aİ-nın yardımları Avropa Qonşuluq Aləti (ENİ) üzrə davam etdirilir. ENİ çərçivəsində illik maliyyə yardımları hər il Azərbaycanla imzalanan Fəaliyyət Proqramları vasitəsilə həyata keçirilir. Maliyyə yardımının 2014-2017-ci illərdə əsas istiqamətləri - (1) regionların və yerlərinin inkişafı, (2) ədliyyə sahəsində islahatlar, (3) təhsil və bacarıqların inkişafı prioritetlərinə yönəldilmişdir.

Aİ-nın Azərbaycanla ikitərəfli əməkdaşlığının strateji çərçivəsi, əsas nəticələri və indikativ maliyyə ayırımları Vahid Dəstək Çərçivəsi sənədində müəyyən olunmuşdur. Eyni zamanda Azərbaycan ENİ çərçivəsində həyata keçirilən regional layihələrdə, həmçinin enerji, nəqliyyat, trans – sərhəd əməkdaşlıq və s. iştirak hüququna malikdir.

Aİ-nın ENİ ilə yanaşı, Demokratiya və İnsan Hüquqları üçün Avropa Aləti, Sabitlik və Sülhə töhfə Aləti, Vətəndaş Cəmiyyəti Təşkilatları və Yerli idarəetmə orqanları, İnsan inkişafı, Miqrasiya və Sığınacaq tematik mexanizmləri üzrə maliyyələşdirmə alətləri də mövcuddur.

TACİS əməkdaşlığın standartlaşdırılmış prosedurunun elə arxitipidir ki, konkret vəziyyətə uyğunlaşmaqda daxili imkanlara malik deyildir. Layihələrin işlənməsi prosesi digər regionlardakı, bir qədər açıq desək, Mərkəzi və Şərqi Avropada olan mövcud proqramların avtomatik surətdə surətinin çıxarılması tendensiyasına malikdir. Sərf edilən vəsaitlərin çatışmazlığı TACİS proqramının reallaşdırılması zamanı aşkar olur.

Bundan əlavə, TACİS proqramı çərçivəsində qərarların qəbul edilməsi və implementasiya prosesi lazımi səviyyədə cəld deyil və tez bir zamanda köhnələndir. Vəsaitin əldə edilməsi çox çətindir ki, layihələri ödəmək üçün çox vaxt tələb olunur və vəsaitin əsas hissəsi Aİ əməkdaşlarının əmək haqqının ödənilməsinə yönəlir. Axırıncılar çox vaxt işlədikləri ölkələr barəsində çox az təsəvvürlərə malik olurlar və çox zaman yerli imkanlara sərbəst yanaşırlar. Bu halda layihənin reallaşdırılmasının effektivliyinin hesablanması çətinləşir. Qərb firmasının təqdim etdiyi texniki yardım paketi qiymətləndirilir. Bu halda firmalar bəyan edə bilərlər ki, reallaşdırma mərhələsi üçün məsuliyyət daşımırlar, çünki onlar yalnız «nou - hau»-nu təqdim edirlər.

Чернявский.С (1998: 139) Müstəqil Dövlətlər Birliyinə və Gürcüstana Texniki yardım – TACİS Avropa Birliyinin MDB və Gürcüstanın 11 əyalətində davam edən iqtisadi islahatlar və inkişaf prosesini dəstəkləmək üçün xüsusi səydir. Proqramın məqsədi: ayrı-ayrı dövlətlərin səmərəli fəaliyyət göstərən bazar iqtisadiyyatlarının inkişafına kömək etməkdir. Xüsusi mülkiyyət və təşəbbüskarlığa əsaslanan və plüralist demokratik cəmiyyətlərin inkişafını təşviq edən TACİS-in maliyyələşdirilməsi məsləhət, nou – hau və praktiki təcrübə təmin edir. Mümkün olduğu təqdirdə, müxtəlif sektorlarda fəaliyyətlərin birləşdirilməsi ilə proqramın effektivliyi artırılır. Alıcı dövlətlər, ölkələri üçün TACİS proqramlarının qərar qəbul edilməsində və idarə olunmasında yaxından iştirak edirlər. TACİS dövlətləri TACİS proqramı çərçivəsində alıcı dövlətlər Müstəqil Dövlətlər Birliyinin və Gürcüstanın 11 üzvüdür: - Ermənistan-Azərbaycan – Belarusiya – Gürcüstan – Qazaxıstan – Qırğızıstan – Moldova – Rusiya – Tacikistan – Türkmənistan – Ukrayna – Özbəkistan TACİS proqramı 1990-cı ildə dekabr ayında Avropa Şurasının iclasından sonra quruldu. EC Üzv Dövlətləri iqtisadi islahatlar və canlanmanın, dünya iqtisadiyyatına sürətli bir şəkildə inteqrasiya edilməsində

köhnə Sovet İttifaqı səlahiyyətlilərinə kömək etməyi qəbul etdilər. TACIS proqramında beş prioritet sektor bunlar idi: təlim, enerji, nəqliyyat, maliyyə xidmətləri, qida paylanması.

TACİS proqramı və onun regional toplananları, onların müəllifləri və analitiklər tərəfindən uzunmüddətli münaqişələrin nizama salınmasına yönəldilmiş struktur amil kimi nəzərdən keçirilir. Lakin bu zaman bəzi tənqidi qeydlər mövcuddur ki, bu da TACİS proqramının bu meyarının effektivliyini şübhə altına alır. Benefisiant dövlətlərdən alınan informasiya və proqram çərçivəsində bütün fəaliyyətin koordinasiya mərkəzi Brüsseldə yerləşir ki, yerlərdəki layihələrin ümumi koordinasiyası mövcud deyildir və onların rəhbərlərinin bir-biriləri ilə heç bir əlaqəsi yoxdur. Eyni zamanda belə təsəvvür yaranır ki, TACİS proqramının öz çərçivəsində belə dağınıqlığı aradan qaldırmaqdan və layihələrin əlaqəli asılılığını və qarşılıqlı surətdə tamamlanmasından ötrü heç nə edilmir.

Bu regiondakı dövlətlər arasındakı gərginliklə, iqtisadi və siyasi sistemlərinin keçid dövrünü yaşayan ölkələrdə layihələrin koordinasiyasının mürəkkəbliyi ilə izah olunur.

## Nəticə

Beləliklə, komissiyanın daim bəyan etdiyi TACİS proqramını regional əməkdaşlıq və mövcud münaqişələrin nizama salınmasının bir aləti kimi istifadə etmək istəyi mövcud vəziyyətlə uzlaşır. Bu kontekstdə TACİS proqramlarının yayılmadığı Azərbaycanın Dağlıq Qarabağ bölgəsi əyani nümunədir. Ermənistanın TACIS proqramının Dağlıq Qarabağa genişləndirilməsi Azərbaycan hökumətinin razılığı olmadığından Avropa İttifaqı tərəfindən rədd edilmişdir.

Lakin komissiya proqramın reallaşdırılmasının bütün dövrü ərzində onun ixtiyarında olan maliyyə alətlərindən təkəbbürlü siyasi məqsədlər üçün istifadə etməyə səy göstərmişdir:

- Regional əməkdaşlığın möhkəmləndirilməsi
-mövcud münaqişələrin həll edilməsi üçün iqtisadi və siyasi zəminin yaradılması

TACIS proqramı çərçivəsində regional proqramların reallaşdırılması vacib əhəmiyyət kəsb edir.

## Ədəbiyyat

1. Скляров Л., Каспийский регион - сотрудничество или соперничество, «Азия и Африка сегодня», 1996, №29.
2. Хлопов О.А., Прикаспийский регион: транснациональное сотрудничество, Вестник МГУ, 2001, №4.
3. Чернявский С., Западная активность в Закавказье, «Международная жизнь», 1998, №6.
4. Языкова Л., Страны Кавказа в международной политике. «Современная Европа», 2001, №2.

**Rəyçi: s.e.d. R.Sevdimalıyev**

Göndərilib: 26.02.2021 Qəbul edilib: 28.02.2021

DOI: 10.36719/2663-4619/63/88-91

**Aytəkin Yusif qızı Salifova**
Azərbaycan Dövlət Pedaqoji Universiteti
dissertant
aysalifova@mail.ru

# SƏMƏD VURĞUN BƏDİİ DİLİNDƏ ONOMASTİK VAHİDLƏR

***Açar sözlər:*** *onomastika, antroponim, toponim, etnonim, hidronim, ktematonim, kosmonim, zoonim, apelyativ, semantik*

**Onomastic units in the literary language of Samad Vurgun**
**Summary**

Onomastic units mean a special number. This field is one of the focus areas of research in modern Azerbaijani linguistics. Special attention is paid to the development of onomastic units in the literary language of our great poet S.Vurgun, who played an exceptional role in the enrichment of the Azerbaijani language. Each of the onomastic units was skillfully used in the work of S.Vurgun. Research shows that our artists used the appellation of words when naming images. This is clearly reflected in the literary language of S.Vurgun. In S.Vurgun's poem, the names are arranged according to the descriptive situation of the event.
***Key words:*** *onomastics, anthroponym, toponym, ethnonym, hydronym, ctematonym, cosmonym, zoonym, appellation, semantic*

## Giriş

Bildiyimiz kimi, onomastika dilin lüğət tərkibində olan xüsusi adlardır. Ondan bəhs edən dilçilik şöbəsi isə onomalogiya adlanır. Onomalogiya dilçiliyin gənc sahələrindən biri kimi tanınır. Onomastik leksikanın təsnifi belədir: 1) Antroponimlər (Şəxs adları, soyad, təxəllüs və ləqəblər öyrənilir); 2) Etnonimlər (tayfa, xalq, millət adını bildirən sözərdir); 3) Toponimlər (torpaqla bağlı obyektlərin adını bildirən sözlərdir); 4) Hidronimlər (su obyektlərinin adı öyrənilir); 5) Zoonimlər (heyvan adları öyrənilir, quş adı da daxildir); 6) Kosmonimlər (səma cisimlərini adları öyrənilir); 7) Ktematonimlər (maddi mədəniyyət abidələrinin, elm və texnika adlarının, təşkilat, məqalə, park və s adların öyrənilməsi ilə məşğul olur).

"A.Qurbanov (2004:18) yazmışdır ki, onomastik vahidlər apelyativ leksika ilə qarşılıqlı əlaqə nəticəsində törəyib inkişaf etmişdir. Cəmiyyətin inkişafı ilə bağlı ümumi sözlərdən onomastik vahidlərin yaranması get – gedə artıb çoxalmışdır". Bu fikrə əsalanaraq da S.Vurğunun bədii dilində işlənən saysız-hesabsız onomastik vahidə çevrilən bir çox apelyativləri nümunə göstərmək olar. Bunlardan: vaqif - Vaqif; arif - Arif; səadət - Səadət; məhəbbət Məhəbbət, ülkər - Ülkər və s. kimi adların istifadəsi yetərincədir.

Azərbaycan dilinin zənginləşməsində müstəsna rol oynayan dahi şairimiz Səməd Vurğunun bədii dilində onomastik vahidlərin işlənməsi xüsusi diqqət çəkir. Puşkinin "Yevgeni Onegin" poemasını Azərbaycan dilinə tərcümə edəndə "Rusiya şeirinin şah əsərini, çevirdim Vaqifin şirin dilinə"deməsi poetik siqləti, üslubu məqamı ilə seçilir. Vaqif sözü onomastik vahid kimi əsərdə ideya – bədii təsirin güclənməsinə xidmət edən vasitəyə çevrilir. S.Vurğunun böyüklüyü – üslubi məqam ilə obrazlığı yarada bilməsinədir – bir sadə, kiçik leksik vahidlə böyük obrazlığın ifadə edilməsindədir. (Hüseynova, 2017: 19).

Məqalədə qısa şəkildə də olsa S.Vurğunun bədii dilində işlənən onomastik vahidlər araşdırılacaqdır.

S.Vurğun poeziyasında adların reallıqdan qeyri-reallığa, mifik səciyyə daşımağa doğru inkişafı var. "A.Qurbanov (1988: 14) qeyd etmişdir ki, real vahidlər bədii əsərlərdə mövcud həyat hadisələrinin təsviri məqsədilə işlədilir. Məsələn S.Vurğunun "Vaqif" pyesində Vaqif, Vidadi, Qacar, İbrahim xan şəxs adları, Qazax, Qarabağ, İran, Gürcüstan kimi yer adları real onomastik vahid hesab olunur. S.Vurğun bu adları tarixdən, real həyatdan götürmüş və onları olduğu kimi də əsərə daxil etmişdir". Səməd Vurğun yaradıcılığında adların reallığı xüsusi maraq doğurur və bunların böyük əksəriyyəti xalqın həyatında xüsusi rol oynamış şəxsiyyətlərdir. Əsas məsələ isə həmin **antroponimlərin** mətnə gətirdiyi poetik pafosdur, yəni onların S.Vurğun yaradıcılığında üslubi xüsusiyyətlərinin açılışıdır:

Bu şeir yurdunun böyük kəlamı,
Yurdumu seyr edən qoca Nizami,
Onun dalğalanan könül dənizi,
Leylinin təzədən gülər bənizi,
Fərhad külüngünün nişanələri,

Tarixin ən gözəl əfsanələri,
Bizə nələr deyir bu bəxtiyarlıq?! (S.Vurğun, 2005 : 46, II c )

S.Vurğun burada Nizamini adının leksik mahiyyətində sözün nizamının sahibi kimi semantik mənada yaşadırsa, Leylini məhəbbətin, Fərhadı bu yolda əzablar sahibinin müəllifi kimi bir anlamda təqdim edir.

Antroponimlərin üslubi imkanları ilə bağlı araşdırmalar göstərir ki, sənətkarlarımız obrazları adlandırarkən sözlərin apelyativindən istifadə etmişlər. (Mikayılova, 2008:58). "A.N.Mikayılova (2008:59) həmçinin qeyd etmişdir ki, Nizaminin "Xosrov və Şirin" poemasının təsiri nəticəsində "Fərhad" əsas etibarı ilə müsbət qəhrəmanlara verilən adlardandır". Bunu S.Vurğunun "Fərhad və Şirin" "əsərindən də görürük".

Burada S.Vurğun rəvayət və əfsanələrdə yaşayan antroponimlərə müraciət edir. S.Vurğun şeirində **etnonimlərin** işlənmə dairəsi öz leksik – semantik üslubu baxımından xüsusi maraq kəsb edir. Nümunəyə nəzər salaq:

Tatar da, gürcü də, rus da, türkmən də
Ehtiram saxlayır bu böyük ada.
Bu ada könlümü vermişəm mən də
Şeirim qanad çalır yeni dünyada (S.Vurğun, 2005 : 201, I c )

S.Vurğun yaradıcılığının üslubi xüsusiyyətlərindən biri də **toponimlərin** təsvir və tərənnüm səciyyəsidir. S.Vurğun şeiri özlüyündə təsvirin elə orijinal xüsusiyyətlərini qazanıb ki, bu da ona poetik məna verib. Həmin təsvirlərin böyük əksəriyyətində toponimik vahidlərin xatırlanması vardır. Onu da xatırladaq ki, toponimlərin hər birisi sözdür və dil qanunlarına tabedir. Bu fikrə V.A.Nikonovun kitabında da rast gəlirik. (Никонов В, 1965:66) Digər cəhət isə həmcins təkrarların yaratdığı təəssüratdır. Burada regionun təbii landşaftı, etnoqrafik ənənələri yada gəlir və daha çox şeir, poetik misra onları diqtə edir. Nümunə üçün şairin "Azərbaycan" şeirinə baxaq. Bunu tədqiqatçılar S.Vurğun şeirinin estafeti hesab edirlər:

Keç bu dağdan, bu arandan,
Astaradan, Lənkərandan,
Afrikadan,Hinsdistandan,
Qonaq gəlir bizə quşlar,
Zülm əlindən qurtulmuşlar ( S. Vurğun, 2005 : 177, I c )

Şair burada müxtəlif istiqamətli sadalama aparır. Ancaq bu nümunədə poetik vüsət o qədər güclüdür ki, onun mahiyyətinə, hansı məqsədlə sadalanma aparmasına düşünmə yeri qalmır. Şeirin ümumi məzmununa diqqət yetirdikdə toponimik vahidlərin, daha doğrusu, məkanın qarşılaşması var. Birinci tərəf Astara və Lənkərandı, buraya quşlar rahatlıq, rahat həyat üçün gəlirlər. Şairin poetik duyumunda bura rahatlığın məkanıdır. İkinci məkan isə Afrika və Hindistandır, Astaraya, Lənkərana axışanlar Afrikadan, Hindistandan gələnlərdir. Bu gün həmin regionun semantikası da əzab, əziyyətlərin, böyük ağrıların olduğu təəssüratını verir. Həmin şeirin başqa bir bəndinə nəzər salaq:

Min Qazaxda köhlən ata,
Yalmanına yata-yata,
At qan-tərə bata-bata,
Göy yaylaqlar belinə qalx,
Kəpəz dağdan Göy gölə bax (S.Vurğun, 2005:178, I c)

Burada etnoqrafik təcəssüm vardır. Şairin sanki təsvirini verdiyi regionun etnoqrafik xüsusiyyətlərinin əks etdirmək istəyir. Qazaxın köhlən atı tarixən məşhur olub, dilboz atları ölkəmizin sərhədlərindən kənarda kənarlarda da ad-san qazanıb. S.Vurğun Qazaxdan Kəpəzə gedən yolu, yaylaqların gözəlliyini və Kəpəzdən ikinci bir gözəlliyə-Göy-gölə baxmağın əvəzsizliyini vurğulayır. Burada Göy-göl hidronimdir. Bunun leksik mənası ilə semantik mahiyyəti füsunkar gözəlliyin qarışığında dayanır. Təsəvvürdə poetik mənzərə yaradır. Dağların al-əlvan təbiəti və bu gözəlliyə gözəllik qatan Göy-göl. Təsadüfi deyil ki, şairlər onu təbiətin qızı adlandırırlar. S.Vurğun yaradıcılığında **hidronimləri** iki istiqamətdə izləmək olar. Birincisi sırf Azərbaycan ərazisinə bağlı hidronimlər, ikincisi isə Azərbaycan ərazisində kənarda olan hidronimlər. Bunların hər birinin özünəməxsus dil və üslub xüsusiyyətləri vardır.

"A.Qurbanov (2019:257) hidronimlərin leksik xüsusuiyyətləri araşdırmalarını maraqlı bir şəkildə yekunlaşdıraraq qeyd etmişir ki, 500-dən çox hidronim üzərində apardığımız təhlil və araşdırmalar göstərir ki, dil tərkibinə görə azərbaycan hironimlərinin 99 faizi azərbaycan dilinin öz sözləri əsasında yaranmışdır. Başqa xüsusi adlar qrupunda bu xüsusiyyət nisbətən zəif təzahür edir. Burada iki istiqamət-həm hidronimlərin azərbaycan dilinə məxsus sözlərdən yaranması, həm də digər xüsusi adlar qrupundan fərliliyi diqqəti cəlb edir. Digər bir maraqlı cəhəti də əlavə etmək olar ki, həmin adlanmaya çay, göl, dəniz, bulaq, su kimi sözlər artırılır: Maralgöl, Göygöl, Ağgöl, Qarasu, Qanlıgöl və s. buna misal ola bilər və bunlarda ikinci

bir komponentin olmaması anlamın özündə bir dolaşıqlıq yaradır. Kür, Araz və s. kimi bir sıra adlar bu sırada müstəsna təşkil edir “. Bunu özlüyündə hidronimlərin yaranma yolu kimi anlamaq olar:

Kürün qırağında, Muğan düzündə,
Zəmili, tarlalı suyun gözündə,
Salmanlı adlanan bir kəndciyəz var (S.Vurğun, 2005 : 288, III c )

Göründüyü kimi, burada Kür çayı sahilində olan bir kəndin, Salmanlının təsviri verilir və bu adi təsvirdir. Lakin sözün poetik məqamında adi olanın qeyri-adiliyi dayanır və Kürün daşıb-coşması, təlatümləri var. Bundan əlavə Araz çayının həsrət, ayrılıq anlamı ifadə edən qalanına fikir verək:

Nədir bu həsrətin adı, ünvanı?
Baisin evində işıq yanmasın!
Ah Araz, ah Araz vədimiz hanı?
Bir ürək ikiyə parçalanmasın. (S.Vurğun, 2005:210, I c )

S.Vurğun yaradıcılığında hidronimlərin leksik-semantik üslubi xüsusiyyətlərini nəzərdən keçirək:

Ormanlar içində İsa bulağı,
Ondan əskilməyir insan qaymağı. (S.Vurğun, 2005:107, III c)

S.Vurğun İsa bulağı hidronimini təbiətin füsunkarlığı, əsrarəngizliyi məqsədilə işlədir. Tarixi şəxsiyyətlərin xatırlanması S.Vurğun yaradıcılığının əsas xüsusiyyətlərindəndir.

Zoonimlər iki yerə ayrılır: 1) Ümumi zoonimlər; 2) Xüsusi zoonimlər; S.Vurğun bədii dilində kifayət qədər ümumi **zoonim** nümunələrinə rast gəlmək olar. S.Vurğun zooloji leksikaya aid müxtəlif sözlərdən istifadə etməklə əsərlərinin obrazlılığını, bədii təsir gücünü daha da artırmışdır. Məs:

Vaxtsız xoruz olub çıxırsan dama,
Səsin gülünc gəlir qansan adama,
Yaxud qəlbin çamırlıqdır, çox qırıldama,
Qurbağa səsindən qulaq kar olmaz ! (S.Vurğun, 2005:242, I c )

Misradakı xoruz və qurbağa zooleksemlərinin hər birinin metaforik məna bildirdiyi aydındır. Bu zooleksemlər təsadüfi işlənməmişlər, şair onların real və məcazi mənalarının uyğunluğunu nəzərə almışdır.

Xüsusi zoonimlər heyvanlara verilən xüsusi adlar, ləqəblərdir. Ümumi zoonimlərdən fərqli olaraq xüsusi zoonimlər onomastik vahidlərdir. S.Vurğun bədii dilində işlənən xüsusi zoonimlər:

Sonra Koroğludan, bir də Qıratdan...
İnsan yorulmadı bu xatiratdan... (S.Vurğun, 2005: 17,III c)

Könlüm Qırat kimi dönmüş ağ yelə,
Qızışır getdikcə uzaq mənzilə. (S.Vurğun, 2005: 145, III c)

S.Vurğun şeirində **ktematonimlərin** işlənməsinə nəzər yetirək:

“Dürrənin səsi”,
“Dilcan dərəsi”,
“Gözəllərim”,
“Qəzəllərim”,
..lərim.., lərim...
və nələrim...

Artıq gözlərimdən uzaqlaşdınız;
Ölən bir cahanla siz
gülüşsüz qucaqlaşdınız... (S.Vurğun, 2005: 114, I c)

Burada qüdrətli şairin ktematonimlərdən məharətlə istifadə bacarığı diqqət çəkir. Adları çəkilən “Dilcan dərəsi“, “Dürrənin səsi” , “Gözəllərim”, “Qəzəllərim” yazdığı əsərlərdir. Digər nümunəyə nəzər salaq:

Firdovsi otuz il “Şahnamə” yazdı
Bir də “İliada” nı yaratdı Homer. (S.Vurğun, 2005 : 319, III c)

Göründüyü kimi, ktematonimlərdən məharətlə istifadə etməsi şairin istedadını üzə çıxaran amillərdən biridir.

Şairin bədii dilində **kosmonimlərin** də işlənmə dairəsi genişdir:

Azadlığın səhərinə,
Günəş rəngli bayraq asdın.
Qoy var olsun o mərd elin!
O saf eşqin, saf əməlin. (S.Vurğun, 2005: 103, II c)

Sən göylər yolçusu bir azad quşsan,
Aylı gecələrdə görürəm səni.
Zöhrə ulduzuna məftun olmuşsan,
- Sürürsən üstünə öz təyyarəni! (S.Vurğun, 2005: 208, I c )

Şairin bir neçə səma cisminin adını sadalaması onun sənətkarlığının bariz nümunəsidir. Onu da qeyd etməliyik ki, şairin əsərlərində kosmonimlər yetərincədir.

## Nəticə

Göründüyü kimi, onomalogiya elmi böyük bir sahəni əhatə edir. Onomastik vahidlərin hər biri ayrı – ayrılıqda bir tədqiqat sahəsidir.” F.Engels (1971:94) yazır ki, bir qrup adlar vardır ki, bütün tayfada bu adlardan yalnız həmin qəbilə istifadə edə bilər , belə ki ayrıca bir adamın adı da onun hansı qəbiləyə mənsub olduğunu göstərir“. Ad seçmək bacarığı sənətkarlıq tələb edir. S.Vurğunun bədii dilində onomastik vahidlərdən ustalıqla istifadə bunu sübut edən faktlardandır. Qeyd etmək lazımdır ki, bu yaradıcılıq şərtidir və sənətkarın bacarığını nümayiş etdirən ən əsas məsələlərdəndir. S.Vurğun şeirində bu adlar məqamına, hadisənin təsvir vəziyyətinə görə sıralanır. Bu cür hal da əlbəttə ki, yaradıcılığın bədii çalarını artıran mühüm vasitələrdəndir.

## Ədəbiyyat

1. Afad Qurbanov. Azərbaycan onomalogiyasının əsaları. I cild ( 2 cilddə ), Bakı, “Nurlan”, 2004 – 340 s.
2. H.Hüseynova. Bədii əsərlərdə onomastik vahidlərin rolu. ADPU – nun nəşri, Bakı 2017, 190 s.
3. A.Qurbanov. Poetik onomastika. Dərs vəsaiti, Bakı, V.İ.Lenin adına APİ-nin nəşri, 1988, 40 s.
4. Ə.N.Mikayılova. Onomastik vahidlərin imkanları. (XIX əsrin II yarısında yaranmış nəsr əsərlərinin materialları əsasında linqvistik tədqiqat) “Memar Nəşriyyat-Poliqrafiya”. MMC, Bakı, 2008, 302 s.
5. Никонов В.Введение в топонимику. М., Наука, 1965, с.66, 179 стр.
6. A.Qurbanov.Azərbaycan onmalogiyasının əsasları. II cild (2 cilddə), Bakı, 2019, 432 s.
7. F.Engels: Ailənin, xüsusi mülkiyyətin və dövlətin mənşəyi, Bakı , 1971, 240 s.
8. Səməd Vurğun. Seçilmiş əsərləri. Beş cilddə. I cild. Bakı, "Şərq-Qərb", 2005, 264 s.
9. S.Vurğun. Seçilmiş əsərləri. Beş cilddə. II cild. Bakı, “Şərq-Qərb”, 2005, 248 səh.
10. Səməd Vurğun. Secilmiş əsərləri. Beş cilddə. III cild. Bakı, "Şərq-Qərb", 2005, 424 s.

**Rəyçi: prof. B.Xəlilov**

Göndərilib: 23.02.2021 Qəbul edilib: 25.02.2021

DOI: 10.36719/2663-4619/63/92-95

**Melek Anday Rifat qızı Tolunay**
Bakı Dövlət Unıversiteti
doktorantı
andaytolunay@gmail.com

# CİNSEL SAĞLIK EĞİTİMİNİN ÇOCUK VE ERGEN YAŞAMINDAKI YERİ

***Açar sözlər:*** *cinsel sağlık eğitimi, cinsel sağlık, üreme sağlığı, istismar, ebeveynler, çocuk istismarı, çocuk eğitimi, cinsel bilgi kaynağı*

## The place of sexual health education in the life of children and adolescents

**Summary**

The general purpose of planned sexual health education for children and young people is to provide them with sufficient information about sexual health according to their age range, to inform them about attitude-value and understanding, to gain relationship and interpersonal skills, to develop their necessary responsibilities.

The protection, development and maintenance of sexual health depends on the awareness of individuals about sexuality and sexual health. Awareness begins in the family and is provided with comprehensive sexual health education in accordance with the needs in all periods of life such as preschool, school and after school. Sexual health education is not welcomed in developing countries. At the heart of this is the belief that sexual health education will encourage young people to have sexual intercourse. The development of sexual education is achieved in all age ranges with questions and answers that arise according to different age characteristics. Sexual health education is a very important factor for the psychological and physiological health of individuals in a society.

***Key words****: sexual health education, sexual health education, reproductive health, abuse , parents, child abuse, Source of sexual information*

Cinsel sağlık eğitimi insanın var olduğu andan itibaren yaşamı boyunca devam eden bir süreçtir. Bu süreç; sağlık, eğitim, sosyal refah ve yasal sistemlerin tam olarak katılımını gerektiren geniş temelli, toplum destekli bir etkinliktir. Çocuklara ve gençlere yönelik planlanan cinsel sağlık eğitimlerinin genel amacı cinsel sağlık hakkında onlara yaş aralıklarına göre yeterli bilgi sağlamak, tutum-değer ve anlayış hakkında bilgilendirmek, İlişkiler ve kişiler arası beceri kazandırmak, gerekli sorumluluklarının geliştirilmesidir. Cinsel sağlığın korunması, geliştirilmesi ve sürdürülmesi bireylerin cinsellik ve cinsel sağlık konusunda bilinçlenmelerine bağlıdır. Bilinçlenme ailede başlar, okul öncesi, okul ve okul sonrası gibi yaşamın her döneminde gereksinime uygun şekilde kapsamlı cinsel sağlık eğitimiyle sağlanır. Cinsel sağlık eğitimine gelişmekte olan ülkelerde sıcak bakılmamaktadır. Bunun temelinde cinsel sağlık eğitiminin, gençleri cinsel ilişkiye teşvik edeceği kanısı olduğu düşünülmektedir. Oysa araştırmalar gençlere verilen kapsamlı bir cinsel eğitimin; cinsel ilişkiyi ertelediği, cinsel ilişki sıklığını azalttığı, gençlerin cinsel yolla bulaşan hastalıklardan daha iyi korunduğu ve daha olumlu arkadaşlık ilişkileri kurduğunu göstermektedir. Ayrıca bu eğitimin bireyin fiziksel, duygusal ve cinsel gelişimini anlamasına, güvenli ve sağlıklı cinsel davranış geliştirmesine yardımcı olmakla birlikte başkalarının görüşlerine, davranışlarına ve yaşam şekillerine, saygılı olma bilinci kazandırdığı bilinmektedir.

Dünya Sağlık Örgütü (DSÖ), cinsel sağlığı; "cinsel yaşamın bedensel, ruhsal, zihinsel ve sosyal açıdan bir bütün olarak ele alınması yoluyla kişilik, iletişim ve sevginin olumlu yönde zenginleştirilmesi ve güçlendirilmesi" olarak tanımlamaktadır (Özcebe 2007; İKGV 2003; Sezgin 1998).

Başka bir tanıma göre cinsel sağlık; cinsel yolla bulaşan hastalıklar (CYBH)' dan korunmak, üremeyle ilgili sorunlardan uzak, doğum kontrolü, istenmeyen gebelikleri önlemek ve cinsel işlevin fizyolojisine uygun sıkıntısız ve istismardan uzak olumlu deneyimler yaşayabilmektir.

Bunların sağlanabilmesi için cinsel sağlığın korunması ve sürdürülmesi gerekmektedir. Cinsel sağlığın korunması, geliştirilmesi ve sürdürülmesi kapsamlı bir cinsel sağlık eğitimi ile mümkündür (Özcebe 2007; Çok 2004; Gendel and Bonner 1992).

Amerika Birleşik Devletleri (ABD) Cinsel Bilgi ve Eğitim Konseyi (SIECUS 1996-Sexuality Information and Education Council of United States)'ne göre cinsel sağlık eğitimi (CSE); yaşam boyu süren bilgi alma, tutum, inanç ve değerler kazanma sürecidir. CSE bireyin, özel yaşantısında olduğu kadar aile ve toplum yaşantısında da mutlu olmasını, erken yaşlardaki gebelikleri, düşükleri, CYBH ve HIV/AİDS'i

önlemek, doğru ile yanlışı, sağlıklı ile hastalıklı arasında seçim yapmanın inceliklerini kavratmak, sorumlu cinsel davranışların ve ilişkilerin güzelliklerini öğretmeyi amaçlar (Özcebe 2007; Çok 2004; Sağlık Bakanlığı 2005; Taşçı 2002).

İnsanlar doğdukları andan itibaren, başta aileleri olmak üzere yakın çevrelerinden cinsellikle ilgili çeşitli mesajlar almaya başlarlar. Ebeveynler çocuklarının cinsellikle ilgili konularda ilk eğiticileridir. Ebeveynler bu konuda çocuklarına direk bilgi verdikleri gibi, çocuklarının cinselliğe yönelik tutum ve değer yargılarının gelişmesinde de önemli rol oynamaktadırlar. Onlar çocuklarıyla konuşma, duygularını paylaşma, sevgi gösterme, onları giydirme ve onlara vücut bölümlerinin isimlerini öğretme gibi davranışlarla çocuklarına cinsellikle ilgili ilk bilgileri ve değer yargılarını aktarmaktadır (Hassan and Creatsas 2000, Snegroff 2000). Çocuklar büyüdükçe sosyal çevre içindeki ilişkileri de gelişmektedir. Böylece onlar ailelerinin dışında öğretmen, arkadaşlar, televizyon, müzik, kitaplar, reklamlar ve oyuncaklar gibi birçok kaynaktan cinsellikle ilgili uygun davranış ve değerler hakkında mesajlar almaya ve bilgiler öğrenmeye devam etmektedirler (Snegroff, 2000; www.fpq.asn.au 2001,www.pptc.org 2002). Çocukların ve gençlerin cinsel eğitimlerinde ideal olan, aile içinde başlayan eğitim sürecinin okullarda var olan formal cinsel eğitim programları ile devam etmesidir. Bulunduğumuz coğrafyada birçok ülkede henüz okullarda cinsel sağlıkla ilgili bir ders bulunmamaktadır. Dolayısıyla çocukların ve gençlerin cinsel sağlıkla ilgili konularda bilgi edinmeleri için güvenilir bir kaynak olarak ebeveynlerin rolü ön plana çıkmaktadır.

Ancak birçok toplumda cinsel sağlık konuları aile içinde çok rahat konuşulamamaktadır. Ayrıca ebeveynlerin kendileri de cinsel sağlıkla ilgili formal eğitim programlarından geçmedikleri için bu konuda yeterli bilgiye sahip değiller. Dünya Sağlık Örgütü ’nün gelişmekte olan ülkelere ait verileri, gençlerin cinsel konulardaki bilgi kaynağı olarak en sık arkadaş ve medyayı belirttiğini, öğretmen ve sağlık personelinden bilgi almanın nadir olduğunu ve ebeveynlerin cinsellikle ilgili primer kaynak olmadığını ortaya koymaktadır (www.who.int, 2001). Oysa gelişmiş ülkelerde yapılan çalışmalar ebeveynlerin çoğunluğunun çocuklarıyla cinsel konuları konuşabildiklerini göstermektedir. Bu çalışmalar adolesanların (ergen) daha çok anneleri ile konuşmayı tercih etiklerini de vurgulamaktadır (Diiorio et al. 1999, Jordan et al. 2000, Miller et al. 1998, Raffaelli et al. 1998, Young Pistella and Bonati 1998). Cinsellikle ilgili konularda ebeveynleriyle rahat bir şekilde konuşamayan ve okul yıllarında formal cinsel eğitim programlarından geçmeyen gençlerin, güvenilir olmayan kaynaklardan eksik ya da yanlış bilgi edinme olasılıklarının daha yüksek olacağı söylenebilir. Bilgi eksikliği gençlerin cinsel ve üreme sağlığı alanında yaşadıkları sorunların önemli bir nedeni olarak ele alınmaktadır (Sezgin ve Akın 1998). Çünkü bilgisizlik gençlerin sağlık uygulamaları ve cinsel davranışlarının getireceği risklerin farkında olmalarını engelleyebilmektedir. Bu nedenlerden dolayı başta ebeveynler ve okul sistemi olmak üzere güvenilir kaynaklar tarafından gençlerin cinsel konularda bilgilendirilmeleri oldukça önemlidir. Cinsel sağlık eğitiminin ebeveynler ve profesyoneller tarafından yeterli bir şekilde verilebilmesi için birinci adım, çocukluktaki cinsel gelişim dönemlerinin çok iyi anlaşılmasıdır.

Psikoloji alanında çok önemli eserleri olan Freud’un Dr.M.Fürst’e yazdığı mektupta yer alan şu ifadeler çocuk ve cinsel eğitim kavramı hakkında düşündürücüdür: “…Eğer çocuklardan ya da daha doğrusu gençlerden, beşeri cinsel yaşam hakkındaki söz konusu açıklamaları esirgemekle, ne elde edilmek isteniyor ki? Daha kendi içlerinde bu tür konulara yönelik bir ilgi uyanmamışken, bu ilgiyi zamanından daha önce uyandırmaktan mı korkuluyor? Bu tür bir gizlilikle, cinsel dürtüyü bastırma umudu mu görülüyor?”

Freud’un bahsettikleri içerisinde özellikle çocukların henüz cinselliğe dair ilgilerinin uyanmamış olmasına ilişkin söylediği söz, bebeklik dönemindeki haz ilişkisi bağlamındaki anne ile kurulan ilişkide zannedildiği gibi cinsellik bağlamında bir haz ilişkisi olmadığını, aslında Freud’un çocukta cinsellik konusundaki düşüncelerini uç olarak görünmemesi düşünülmektedir. Bir başka ifade ile Freud, çocuğa verilen masum olma görevinden ziyade çocuğun da istekleri olan bir birey olarak kabul edilmesi gerektiğini, çocuk olmakla birlikte bir insan olduğunun unutulmaması gerektiğini vurgulamıştır.

Freud’un 1905 tarihli Cinsellik Kuramı Üzerine Üç Deneme’si dönemin cinsellik algısına ve ön yargılarına açıkça meydan okuyan en önemli eserlerinden biri olarak değerlendirilir (Quinodoz, 2016, s. 71). Bu eserinde ise çocukluktaki cinsel gelişim dönemini Freud şu şekilde açıklar; çocukluk döneminde cinsel dürtülerin var olduğunu ve çocuğun farklı gelişim dönemlerinde farklı haz kaynakları olduğunu söyler. Anne memesini emmesini buna örnek gösterir ancak burada cinsel doyumun beslenme ihtiyacından ayrışmamış olduğunu vurgular. Freud, çocuk cinselliğinin amacını “herhangi bir erojen bölgenin uygun biçimde uyarılması ile elde edilen doyumdan ibaret” olarak tanımlar. Çocuğun anne memesini emmesi ile başlayan hazzı (oral haz), sonraki gelişim döneminde anal bölgeye (bağırsak işlevlerinin gelişimi ile birlikte tutma ya da boşaltma hazzı) ve 3-5 yaşlarıyla birlikte genital bölgeye yönelecektir. Freud, çocuğun bu yaş döneminde erişkindekinden farklı olarak “araştırma ve bilme dürtüsünden doğan pratik bir gereksinimle” hareket ettiğini

Çünki Qazaxıstan xaricində bütün ölkələrin payı 20%-dən aşağıdır. Belə bölünmə olduğu təqdirdə, Qazaxıstan çox böyük itkiylə üzləşəcəkdi.

**Türkmənistan:** Türkmənistanın Xəzər dənizinin hüquqi statusuna münasibətinin digər sahilyanı dövlətlərdən fərqli olaraq, aydın olmadığını söyləmək olar. Türkmənistan əvvəlcə Rusiya və İran kimi "ümumi istifadə" ideyasını müdafiə edirdi. Daha sonra sahilyanı ölkələrin 12 millik ərazi sularına və 35 millik müstəsna iqtisadi zonaya sahib olmaları gərəkdiyini bildirən Türkmənistan, qalan sahələrin ümumi istifadədə olması fikrini irəli sürdü. Türkmənistan, həmçinin beş sahil dövlətinin Xəzər dənizinin mövcud ehtiyat-larından yalnız öz sahələrində istifadə etməkdə sərbəst oldıqlarını bildirirdi.

Sonralar Xəzər dənizinin beş milli sektora bölünməsini dəstəkləyən Türkmənistan, Azəri və Çıraq neft yataqları səbəbindən oxşar fikri müdafiə edən Azərbaycanla fikir ayrılığı yaşamağa başladı. Türkmənistanın əsas problemi Azərbaycanın qərb ölkələri ilə əməkdaşlıq edərək Türkmənistanla sərhəddə yerləşən mənbələrdən istifadə etməsi idi. Bu bölgələrin birtərəfli fəaliyyətinə qarşı olan Türkmənistan, Azərbaycanın bu bölgələrdəki fəaliyyətini dayandırmasını tələb edirdi. 1998-ci ildən bəri Türkmənistanın Xəzər dənizinin dibindən və akvatoriyasından ümumi istifadəni müdafiə edən İranın fikirlərinə daha yaxın mövqe tutduğunu söyləmək mümkündür. 2003-cü ildə RF-Azərbaycan-Qazaxıstan müqaviləsinə qarşı çıxan Türkmənistan İranla Xəzər dənizinin bölüşdürülməsini nəzərdə tutan Tehran müqaviləsini imzaladı. Beləliklə, Türkmənistan Xəzər dənizinin şimalına dair RF-Azərbaycan-Qazaxıstan müqaviləsinə qarşı İranla müttəfiq kimi çıxış etməyə başladı. Türkmənistanın İranla ortaq olmasının əsas səbəbi Azərbaycanla arasındakı Azəri və Çıraq neft yataqlarından irəli gələn mübahisənin həllində İranın dəstəyini almaq istəməsi idi.

Göründüyü kimi, Xəzəryanı dövlətlərin müxtəlif maraqları səbəbindən Xəzər dənizinin beynəlxalq hüquqi statusunun müəyyən edilməsi olduqca çətinləşmişdi. Ümumilikdə isə Xəzərin hüquqi statusuna münasibətdə 3 variant əsas rol oynayırdı:

1. Xəzər "dəniz" kimi;
2. Xəzər "göl" kimi;
3. Xəzər "xüsusi su hövzəsi" kimi.

Xəzər "dəniz" adlandırılacağı təqdirdə, mövcud münasibətə 1982-ci il tarixli Dəniz hüququ üzrə BMT Konvensiyasının müddəaları tətbiq edilməli idi. BMT Konvensiyasına görə dənizlər açıq və qapalı, yaxud yarım qapalı dəniz olaraq bölünürlər. Açıq dəniz dedikdə, ərazi dənizindən kənarda yerləşən, hər hansı dövlətin və ya dövlətlərin suverenliyinin şamil edilmədiyi, bütün xalqların bərabərhüquqlu və ümumi istifadəsində olan dəniz sahəsi başa düşülür. BMT-nin dəniz hüququ üzrə 1982-ci il tarixli Konvensiyasının 122-ci maddəsində qeyd edilir: "... qapalı ve ya yarımqapalı dəniz iki, yaxud daha çox dövlət tərəfindən əhatə olunan, digər dənizlə, yaxud okeanla dar keçid ilə birləşən va ya tamamilə, ya da əsasən iki və ya daha çox sahilyanı dövlətin müstəsna iqtisadi zonasından və ərazi dənizindən ibarət olan körfəz, hövzə və ya dəniz deməkdir". (6, s. 176) Bu tərifə görə, bir dənizin "qapalı" və ya "yarımqapalı" olmasını təyin edən əsas amil onun digər dəniz, yaxud okeanla dar keçidinin olmasıdır. Tərifdə vurğulanan "dar keçid" Xəzər dənizi baxımından Don-Volqa və Volqa-Baltik kanallarıdır. Əgər Xəzər "dəniz" olaraq qəbul edilərdisə, Rusiya Don-Volqa və Volqa-Baltik kanallarında beynəlxalq su yolları rejimini tətbiq etməli idi. Bu kontekstdə Xəzər dənizi sahilində olan digər dövlətlərin bu kanallardan tranzit keçmək hüququ olacaqdı. Ancaq həm Sovet İttifaqı, həm də RF dövründə bu kanallara "daxili sular"ın rejimi tətbiq edilmişdi və RF bu kanallar üzərində müstəsna səlahiyyətlərindən istifadə edirdi. Bu səbəbdən RF hər zaman Xəzərin "dəniz" kimi qiymətləndirilməsinə qarşı çıxmışdır.

Göl, quru ilə əhatə olunmuş, su səthi dənizlə eyni olmayan və dənizlərlə təbii əlaqəsi olmayan su sahəsidir. Göllər əhatə olunduğu dövlətlərin sayına görə milli və beynəlxalq göllərə bölünürlər. Xəzər beş sahilyanı dövlətin quru sahəsi ilə əhatə olunduğundan o, beynəlxalq göl kateqoriyasına aid edilə bilərdi. Beynəlxalq göllərin hüquqi rejimini tənzimləyən hər hansı beynəlxalq hüquq norması olmadığından Xəzər "göl" adlandırılacağı təqdirdə onun hüquqi rejimi sahilyanı dövlətlərin razılaşdırdıqları qayda ilə müəyyən edilməli idi. Belə olan halda Xəzər, ya beş dövlətin ümumi istifadəsində qalmalı, ya da milli sektorlara bölünməli idi. Bu isə yuxarıda qeyd edildiyi kimi, sahilyanı dövlətlərin maraqları baxımından olduqca ziddiyyət yaradırdı.

Xəzər dənizinin hüquqi statusu ilə bağlı digər qiymətləndirmə isə Xəzərin "xüsusi su hövzəsi" kimi dəyərləndirilməsidir. Rusiya və İrana görə Xəzər dənizi özünəməxsus geoloji hadisələr nəticəsində əmələ gəlmişdir və Xəzərin həm ekoloji, həm də coğrafi baxımdan özünəməxsus xüsusiyyətləri vardır. Bu cür fərqli xüsusiyyətlərə görə isə Xəzərin statusu beynəlxalq hüquq qaydalarına və beynəlxalq praktikaya uyğun olaraq müəyyən edilə bilməz. Rusiyanın fikrinə görə bu halda, Xəzəryanı dövlətlərin razılaşması ilə Xəzərin hüquqi statusu və hüquqi rejimi müəyyən edilməli, yeri gəldikdə, beynəlxalq dəniz hüququ normaları, yeri gəldikdə isə göl statusuna uyğun olaraq normalar tətbiq edilə bilərdi. Gələcəkdə hər hansı boşluqlar müəyyən

edildiyi təqdirdə isə sahilyanı dövlətlərin ümumi razılığı ilə bu qaydalarda müvafiq dəyişikliklər edilə bilərdi.

Xəzəryanı dövlətlərin uzun illər sürən danışıqları sonrasında nəhayət, 2018-ci il 12 avqust tarixdə Qazaxıstanın Aktau şəhərində həmin dövlətlərin rəhbərləri tərəfindən "Xəzər dənizinin hüquqi statusu haqqında" Konvensiya imzalanmışdır. Konvensiyanın qəbul edilməsi Xəzəryanı dövlətlərin ümumi qələbəsi hesab edilirdi, çünki bu aktın qəbulu ilə üzün sürən tarixi problem aradan qaldırılmışdı. Bu Konvensiya ekspertlər tərəfindən Xəzər dənizinin "konstitusiyası" da adlandırılır. Konvensiyanın əsas diqqəti çəkən məqamı "Xəzər dənizi" ifadəsinin işlədilməsinə baxmayaraq bunun sadəcə şərti xarakter kəsb etməsi idi. Konvensiyanın 1-ci maddəsində Xəzər dənizi "tərəflərin quru əraziləri ilə əhatə olunan su hövzəsi" adlandırılmışdır. (7, maddə 1) Konvensiyada hər bir Tərəf üçün eni 15 dəniz milindən artıq olmayan ərazi suları və Tərəflərin ərazi sularına bitişik eni 10 dəniz mili olan balıqçılıq zonası müəyyən edilmişdir. Konvensiyaya görə sahilləri yanaşı olan dövlətlər arasında daxili və ərazi sularının bölünməsi beynəlxalq hüququn prinsip və normaları nəzərə alınmaqla, onlar arasında razılaşmalar yolu ilə həyata keçirilir. (7, maddə 7)

## Nəticə

Göründüyü kimi, Xəzər dənizinin beynəlxalq hüquqi statusunun müəyyən edilməsi Xəzəryanı dövlətlərin sayının çoxluğu və müxtəlif maraqların kəsişməsi, habelə Xəzər dənizinin unikallığı səbəbindən uzun tarixi dövrü əhatə edir. Bununla belə, 2018-ci il 12 avqust tarixli "Xəzər dənizinin hüquqi statusu haqqında" Konvensiyanın qəbul edilməsi ilə bu problem üçün həll yolu müəyyən olundu. Konvensiya mövcud olan bütün zəruri məsələlərə dəqiqliklə aydınlıq gətirməsə belə, onu mübahisənin həlli istiqamətində çox böyük uğur adlandırmaq olar. Ancaq bu, gələcəkdə Xəzəryanı ölkələr arasında Konvensiya ilə əlaqədar mübahisələrin olmayacağına və regionda bu məsələ üzrə daima əmin-amanlığın hökm sürəcəyinə zəmanət vermir.

## Ədəbiyyat

1. Məmmədov R.F. "Xəzər dənizinin beynəlxalq hüquqi statusu: dünən, bu gün, sabah". Monoqrafiya. Azərnəşr, Bakı, 2006, 406 s.
2. Hüseynov L.H. "Beynəlxalq hüquq". Dərslik. Qanun Nəşriyyatı, Bakı, 2012, 368 s.
3. Gurbanov I. "Legal Knot in the Caspian Sea: Hard to Untie". Strategic Outlook, 2014, 4 p.
4. Kocaman E.M. "Hazar havzasının hukuki statüsü". Makale. Ege stratejik araşdırmalar dergisi, 2018, cild:9, sayı:1, 99-114 s.
5. https://dergipark.org.tr/tr/download/article-file/1180603
6. Kovalyov A.A. "Müasir beynəlxalq dəniz hüququ və onun tətbiqi praktikası". Monoqrafiya, Bakı, 2006, 336 s.
7. "Xəzər dənizinin hüquqi statusu haqqında" Konvensiyanın təsdiq edilməsi barədə Azərbaycan Respublikasının Qanunu, Bakı, 12 fevral 2019, http://e-qanun.gov.az/framework/41551

**Rəyçi: prof. R.Məmmədov**

Göndərilib: 16.02.2021 Qəbul edilib: 18.02.2021

DOI: 10.36719/2663-4619/63/107-109

**Elnurə Əflatun qızı Pirəliyeva**
Bakı Dövlət Universiteti
magistrant
elisheflatunlu@gmail.com

# EPİSTOLYAR ÜSLUBUN İNKİŞAF TARİXİ: KEÇMİŞDƏN BU GÜNƏ

***Açar sözlər**: ədəbi tənqid, epistolyar üslub, mənzum məktub,ədəbi məktub, açıq məktub*

**History of the development of epistolary style: from the past to the present**
**Summary**
The first example of epistolary style in world literature is Horace`s Letter to the Pisons. It has been used in the history of Azerbaijani literature in three genres of epistolary style: verse letter, literary letter and open letter. The first example of a poetic letter is in the works of G. Tabrizi in the 11th century by M.F.Akhundov. We meet withopen letters in Akhundov`s works. Open letter is a genre of literary criticsm, verse letter and literary letter are genres of literary criticism.
***Key words**: criticism, epistolary style, verse letter, literary letter, open letter*

Dünya ədəbiyyatında məktub şəklində yazılmış ilk əsər İmperiya dövrü Roma ədəbiyyatının görkəmli şairi Kvint Horatsi Flakın "Poeziya sənəti haqqında" və yaxud "Pizonlara məktub" əsəridir. O sırf nəzəri-tənqidi bir əsər olub, "ədəbi əsərin kompozisiyası", "şifahi ifadə", "xarakterlər", "əsl şairin obrazı", " şair və tənqid" kimi başlıqlar altında qruplaşdırılan fikirləri əks etdirir. Əsərin məktub adlandırılmasının səbəbi onun Pizonlara (Pizon-Romalılar tərəfindən ələ keçirilmiş qədim kelt məskənidir. Əsər Pizonun sakinlərinə müraciət formasında yazılıb-E.P) məktub kimi ünvanlanmasıdır. Nəzmlə yazılmış, qədim Roma ədəbiyyatında ədəbi tənqidin inkişafı üçün əhəmiyyətli olan bu əsərində Horatsi qarşısındakını deyil, birbaşa özünü tənqid edərək, onun timsalında bütün şairlərə tənqidi fikirlərini yönəldirdi:

"Ahəngi, həm üslubu bilmirəmsə bəs nədən,
Utanmadan özümə şair adı verim mən?!
Bilmədiyim bir halda öyrənməyimə məni,
Yalançı bir həyamı vadar eləyir, deyin. (2010: 693)

Bu əsərin epistolyar üslubda yazılması və ədəbi-tənqidi fikirlər ifadə etməsi onu mənzum ədəbi məktub janrında yazılmış bir əsər kimi qəbul etməyimizə əsas verir.

Dünya ədəbiyyatında məktub şəklində yazılan kifayət qədər əsərlər mövcuddur: S.Zveyq "Yad qadının məktubu", AndreMorua "Yad qadına məktublar", FransKafka "Milenaya məktublar", Əziz Nesin "Taxtalı köydən məktublar" və s. Lakin bu əsərlər məktub şəklində olmasına baxmayaraq janrcafərqlənirlər: S. Zveyqin "Yad qadının məktubu" əsəri novella janrında, AndreMoruanın "Yad qadına məktublar" səri esse janrında, Əziz Nesinin "Taxtalıköydən məktublar" əsər hekayə janrında qələmə alınmışdır. "Taxtalıköydən məktublar" əsərində ölmüş eşşək dostu arıya 19 məktub ünvanlayır və bunlar hər biri şəkilcə məktubdur, lakin əsər məktub janrında deyil. Buna görə də, məktub şəklində yazılan əsərlə məktub janrında yazılan əsərlər bir-birindən fərqləndirilməlidir. Ümumşərq ədəbiyyatında da məktub şəklində ("məktub formasında" yox, məhz "məktub şəklində" terminini işlətməyimizin əsas səbəbi ondan ibarətdir ki, Dəhnamələr formaca məsnəvidə yazılır. Qarışıqlıq yaranmasın deyə "məktub şəkli" terminindən istifadə edəcəyik-E.P.) yazılan, lakin janr olaraq fərqlənən əsərlərdən biri də məhz "Dəhnamə"lərdir. Şərq ədəbiyyatında Əraqinin "Dəhnamə"si, Marağalı Övhədinin "Dəhnamə"si, Şeyx Sədəddin Həririnin "Məhbubəlqülub" (Qəlblərin sevgilisi) əsəri (əsərin Dəhnamə adlandırılması haqqında "Orta əsrlərdə vahid şərq ədəbi prosesi" kitabında yazılır: "Məsnəvi on məktubdan ibarət olduğuna görə ona "Dəhnamə" də deyirlər" (S.İbrahimov, 2018: 403), Xətainin "Dəhnamə"si, Rüken Sayın Hərəvinin "Töhfətül-əşşaq" (Dəhnamə") əsəri, Əmad Fəqihin "Dəhnamə" əsəri məşhurdur. Dəhnamələr məsnəvi formasında, həzəc bəhrində, poema janrında, məktub şəklində qələm alınıb. Lakin dəhnamələri də ədəbi məktub janrında yazılmış əsərlərdən hesab edə bilmərik. Epistolyar üslubda yazılmış, məktub janrında qələmə alınan əsərlərə isə Əbuhəmid Əl-Qəzalinin "Məktublar" məcmuəsini, Mövlanə Cəlaləddin Ruminin "Münşəat" (Məktublar) məcmuəsini misal göstərə bilərik.

Azərbaycan ədəbiyyatı tarixində epistolyar üslubun üç janrında istifadə edilib: mənzum məktub, ədəbi məktub və açıq məktub (tarixi ardıcıllığa görə sıralamışıq- E.P.). Müxtəlif elm sahələrində də epistolyar üslubdan və onun janrlarından istifadə edilir, lakin qeyd etməliyik ki, bu janrların hər birini ədəbi kontekstdə tədqiqata cəlb etmişik.

İlk mənzum məktub örnəyinə XI əsrdə siyasi məzmunlu, hökmdar Əbülhəsən Əli Ləşkərinin sərkərdəsi Əbülyəsrlə Qətran Təbrizi arasında olan məktublaşmanı aid etmək olar. Müəllif Ləşkəriyə yazdığı mənzum məktubunda Əbülyəsrə öz minnətdarlığını bildirir. Onun sahəsində hökmdarın yanında yüksək nüfuz, mövqe əldə etməsini söyləyir. Aran sərkərdəsi şairi buraxmaq istəmir, hətta şairi boş-boş gəzməklə günahlandırır. Həmçinin bu məzmun məktubdan o da anlaşılır ki, müəllif vətən həsrəti çəkdiyi üçün Gəncəni tərk etmək istəyir. Bu haqda Ə.Səfərli yazır: "Qətran Təbrizi elə oradaca könlünə Təbrizin havası düşdüyünü, Gəncəni tərk etdiyini xatırlayır:

Təbriz xatirimə düşübdür indi,
Sanki ürəyimdə od şölələndi.
Ta ki Təbriz fikri məndə oyandı,
Canımda elə bil odlar qalandı." (2008: 65)

Vətən həsrətini içində boğa bilməyən şair Gəncəni tərk edərək Təbrizə geri dönür. Bu məktub siyasi xarakter daşımaqla yanaşı, həmçinin mədhiyyə xarakterli olub, eyni zamanda vətənə həsrət məzmununu da ifadə edir.

Mənzum məktublar haqqında "Özümüz və sözümüz" kitabında belə məlumat verilir: "Mənzum məktub- Azərbaycan klassik poeziyasında geniş yayılmış epistolyar forma. Mənzum məktublarda intim-şəxsi xarakterli məsələlər arxa plana çəkilir, əsasən dövrün ictimai-siyasi hadisələrindən, insan taleyindən və s. Geniş bəhs olunur" (Elçin, 2005: 439). Yəni mənzum məktublar həm ədəbi, həm fəlsəfi, həm tarixi, həm siyasi, həm iqtisadi, həm də digər mövzularda ola bilir.

Ədəbi məktub janrında yazılmış ilk əsər Məsud ibn Namdara aid səcli nəsrlə yazılmış məktublardır. Bu məktublar divan məktubları və ədəbi məktublar olmaqla, iki qismə ayrılır. Məsud ibn Namdar məktuba bir janr kimi yanaşmış, müxtəlif mövzularda 17 məktub nümunəsi yaratmışdı. Bu məktublardan bir qismi müxtəlif ədəbi mövzularda yazılıb və ədəbi məktublar adı altında qruplaşdırılıb. Azərbaycan ədəbiyyatı tarixinin ikinci cildində Məsud ibn Namdarın məktubları ilə bağlı belə məlumat verilir: "Dövrün məktublarının xüsusiyyətlərini öyrənmək baxımından Məsud nəsrinin bu qolunun ayrıca yeri var. Onlar da daha çox səcli nəsrlə yazılmışdır və məzmunca iki yerə bölünür: 1. Divan məktubları; 2. Ədəbi məktublar" (AMEA, 2007: 292). Divan məktublarına əmirlər, vəzirlər, maliklər və başqa yüksək vəzifəli divan işçilərinə yazılmış məktublar daxildir. Ədəbi məktublarına isə öz bədiiliyi ilə seçilən, səcli nəsrlə yazılmış məktubları daxildir. Biz Məsud ibn Namdarın hər iki başlıqda toplanan məktublarını epistolyar janrın ilk örnəklərindən hesab edirik.

İlk açıq məktub örnəyinə isə XIX əsrdə Mirzə Fətəli Axundov yaradıcılığına rast gəlirik. Mirzə Fətəlinin 1871-ci ildə yazdığı "Kritika" məqaləsinin V.Sultanlı da açıq məktub tərzində yazılmasını qeyd edir: "Mirzə Fətəli Axundzadənin dərc olunmaq üçün İranın «Millət» qəzeti münşisinəünvanladığı, lakin bəlli səbəblərdən yayınlanmayan «Kritika» adlı yazısı açıq məktub tərzində qələmə alınmışdır"(2019: 38).

Epistolyar üslubun janrlarını bir-biri ilə belə müqayisə edə bilərik.

1) Açıq məktubdan fərqli olaraq epistolyar üslubun digər janrlarının yaranma tarixi daha qədim dönəmə təsadüf edir. Belə ki, XI əsrdə Qətran Təbrizi yaradıcılığında ilk mənzum məktub, Məsud ibn Namdar yaradıcılığında isə ilk ədəbi məktub örnəkləri yaradılıb. Lakin açıq məktubun yaranması XIX əsr Mirzə Fətəli Axundzadənin adı ilə bağlıdır.

2) Açıq məktub ədəbi tənqidin müasir janrlarından biri hesab olunur. Lakin ədəbi məktub və mənzum məktub ədəbiyyatşünaslığın janrıdır.

3) Açıq məktubu epistolyar üslubun digər janrlarındanfərqləndirən ən mühüm cəhətlərdən biri də ondan ibarətdir ki, açıq məktub mütləq yazıldığı zaman dövri-mətbuatda çap olunmalıdır. Belə ki, əgər hər hansısa bir kəsin yazdığı açıq məktub mətbuatda çap olunmursa və illər, hətta əsrlər sonra çap olunursa, biz onu açıq məktub hesab edə bilmirik. Bu zaman həmin məktublar da ədəbi məktub sayılır.

4) Açıq məktub və ədəbi məktub həm nəzmlə, həm nəsrlə (hətta səcli nəsrlə) yazıla bildiyi halda, mənzum məktublar sadəcə nəzmlə yazıla bilir.

5) Açıq məktub ədəbi tənqidin janrı olduğu üçün ədəbi-tənqidi mövzuda yazılır, lakin əksərən kəskin tənqidi ruhda yazılmır, buna baxmayaraq dünya ədəbiyyatında kəskin tənqidi ruhda yazılmış açıq məktublara da rast gəlinir. Ədəbi məktublar adından da göründüyü kimi ədəbi mövzularda yazılır, mənzum məktublar isə mövzu cəhətdən daha geniş olur.

Mənzum açıq məktublardan biri məhz Əkrəm Cəfər tərəfindən Hüseyn Cavidə yazılmış açıq məktubdur. Məktub "Kim kəsərsə tökülən qan izini, Qurtaran dahi odur yer üzünü" proloqu ilə başlayır və Əkrəm Cəfərin yazdığı əsas hissə ilə davam edir:

Hey köhnə şair!
Gözlərindən o köhnə gözlüyü endir.

Yer üzünü qurtarmaz
Nə şairlər, nə dahilər,
Nə filosof, nə peyğəmbər.
Dünyanın dünya boyda dərdi var.
Onu yalnız milyonlar qurtaracaq:
Milyonlar. (1930: 23-24.)

Digər bir nəzmlə yazılmış açıq məktub isə "Bakı intelligensiyasının Stalin yoldaşa məktubu"dur ki, bu məktubun müəllifi, daha doğrusu, müəllifləri məsələsi də diqqətimizi cəlb etdi. Digər açıq məktublardan fərqli olaraq bu açıq məktubun 3 müəllifi var: S.Vurğun, R.Rza, S.Rüstəm (ədəbiyyatımızda çoxmüəllifli açıq məktublara da rast gəlirik-E.P):

Salam sənə alnı açıq evladından, böyük ata!
Şərəf sənin yaratdığın bu işıqlı kainata,
Kimə sorsan deyər bu gün, böyük olsun, uşaq olsun,
"Bu xoş günü bizə verən Stalindir, o sağ olsun! (1939: 1)

Sadəcə Stalinin şəxsiyyəti və "gördüyü işlərin" tərifləndiyi bu açıq məktubda ədəbi tənqidin tələblərinə cavab vermir. Əslində ədəbi tənqid şəxsiyyəti deyil, onun ədəbi fəaliyyətini dəyərləndirmək üçün var. İstər Əkrəm Cəfərin, istərsə də, S.Vurğun, R.Rza, S.Rüstəmin birgə yazdığı açıq məktublar, istərsə də SSRİ dönəminin açıq məktublarının 90%-i ədəbi tənqidin tələblərini ödəmir:

1) Açıq məktub ədəbi tənqidin janrıdır. Ədəbi tənqid şəxsiyyətə deyil, ədəbi fəaliyyətə yönəlir. Təəssüf ki, 1930-cu illərdə ədəbi tənqidimiz də, onun janrları da məkrli siyasətin qurbanı olduğu üçün tənqidimiz siyasiləşdirilmişdir. Açıq məktublarda şəxsiyyət mərkəzi rol oynamışdır.

2) Bu dönəmdəki açıq məktublar tənqidi görüşlər deyil, təhqir və yaxud da şişirdilmiş təriflərlə doludur. Bu məktublarda demək olar ki, heç bir ədəbi-tənqidi görüşə rast gələ bilmirik.

3) Ən önəmlisi isə, həmin dönəmdə tənqidin üstündə elə bir senzura var idi ki, tənqid ədəbi prosesi dəyərləndirmək, yönləndirmək əvəzinə, həmin dönəmdə tənqid yönləndirilirdi. Tənqid obyektivliyini itirmişdi. Bu da, əlbəttə ki, tənqidin bütün janrlarına, o cümlədən açıq məktublara da öz mənfi təsirini göstərirdi. XIX əsr və XX ərin əvvəllərindəki açıq məktublardan fərqli olaraq, 1930-cu illərdə açıq məktubları adi məktublardan fərqləndirən tək şey mətbuatda çap edilməsi idi. Yəni bu dönəmdə sanki ədəbi məktubun ədəbi tənqidin bir janrı olması məsələsi unudulmuşdu.

## Nəticə

Epistolyar üslubun ən gec yaranan janrı hal-hazırda ədəbi tənqidin aparıcı janrlarından olan açıq məktub janrıdır. Açıq məktublar öz səmimiliyi və dil sadəliyi ilə seçilir, onların həm nəzm, həm də nəsrlə yazılmış örnəklərinə rast gəlinir. SSRİ dönəmində ədəbi tənqidin hər janrı kimi açıq məktublar da siyasətə xidmət etdirilmiş, öz obyektivliyini itirmişdir.

## Ədəbiyyat

1. Antik ədəbiyyat antologiyası (tərtib edən Əli Sultanlı). Bakı. "Şərq-Qərb". 2010. 824 səh.
2. İsa Həbibbəyli, Sənan İbrahimov. "Orta əsrlər vahid şərq ədəbi prosesi". I cild. "Ləman Nəşriyyat Poliqrafiya" MMC. Bakı. 2018. 474 səh.
3. Ə.Səfərli, X.Yusifli. Azərbaycan ədəbiyyatı tarixi. Bakı. Ozan. 2008. Səh. 696.
4. Elçin. Seçilmiş əsərləri 10 cilddə. IX cild. Bakı. Çinar-Çap. 2005. Səh. 509.
5. AMEA. Azərbaycan ədəbiyyatı tarixi 6 cilddə. II cild. Bakı. Elm. 2007. Səh 632.
6. Vaqif Sultanlı. Azərbaycan ədəbi tənqidi. Bakı, «Nurlar» nəşriyyatı, 2019, 312 s.
7. Ə. Cəfər. "H. Cavidə açıq məktub"(1930). İnkilab və mədəniyyət. N 11-12. S. 23-24.
8. S.Vurğun, R.Rza, S.Rüstəm. "Bakı intelligensiyasının Stalin yoldaşa məktubu" (1939). Ədəbiyyat qəzeti N 15 (220). S.1-2.

**Rəyçi: prof. Almaz Əli qızı**

Göndərilib: 26.02.2021 Qəbul edilib: 01.03.2021

DOI: 10.36719/2663-4619/63/110-112

**Jalə Musa qızı Hüseynova**
Bakı Dövlət Universiteti
magistrant
jale.huseynova95@mail.com

# OBAMA DÖVRÜNDƏ ABŞ VƏ ÇİN ARASINDA DİPLOMATİK MÜNASİBƏTLƏR

***Açar sözlər:*** *diplomatik, ABŞ, Çin, qlobal problemlər, qarşıdurma*

## Diplomatic relations between the United States and China Under Obama

**Summary**

This article discusses the political developments between the United States and China. It is based on the important political processes that took place between the two countries during the Obama administration in 2008-2016. At the same time, the impact of the meetings held by the leaders of both countries on relations was explained. In addition, the article discusses joint cooperation in solving global problems.

***Key words:*** *diplomatic relations, USA, China, global challenges, confrontation*

## Giriş

20-ci əsrdə ABŞ-ın üç rəqibi var idi - Almaniya, Yaponiya və Sovet İttifaqı. Çinin dünyanın ən böyük istehsalçısı olaraq ABŞ-ı keçməsi ABŞ strateqləri arasında geniş bir narahatlığa səbəb oldu. Soyuq müharibədən sonra ABŞ-ın Çinə dair siyasətinə ümumi nəzər saldıqda, ABŞ Çini müttəfiq və ya rəqib olaraq qiymətləndirmək əvəzinə, gələcəkdə təhlükə olaraq ortaya çıxma potensialına qarşı tədbirlər alarkən, iqtisadi və təhlükəsizlik əməkdaşlığının faydalarını da əldə etməyə çalışırdı.

ABŞ strategiyasının 2 ünsürü vardır. Birincisi, Çinin addımlarına təsir vasitəsi kimi beynəlxalq qurumlarda əməkdaşlıq və inteqrasiyanın rolunu vurğulamaq və Çinin artan yüksəlişini müsbət istiqamətdə - yəni özünə qarşı olmayacaq şəkildə - formalaşdırmaqdır. İkincisi, gələcəkdə hücumçu və ya təhdidkar bir Çinin meydana gəlməsi ehtimalına qarşı bir tədbir olaraq özünün və müttəfiqlərinin hərbi potensialını mümkün olan ən yaxşı şəkildə qorumağın vacibliyini üzərində dayanmaqdır. Bu strategiyanın tətbiqindəki çətinlik bu iki elementi tarazlaşdırmaqda saxlamaqdır.

ABŞ-a məxsus EP-3 hərbi kəşfiyyat təyyarəsinin 2001-ci il apreldə Çinin cənubundakı Haynan adası sahillərində Çinin döyüş təyyarəsi ilə toqquşması nəticəsində adaya məcburi eniş etməsi və Çinə məxsus döyüş təyyarəsinin qəzaya uğraması ilə pilotun həyatını itirməsi iki ölkə arasında "casus təyyarə" böhranına gətirib çıxardı. Böhranın 11-ci günü prezident Buş rəsmi şəkildə üzr istədi və nəzarətə götürülmüş 24 nəfərlik heyət geri qaytarıldı (1).

Buş administrasiyasında Çin ABŞ tərəfindən strateji rəqib olaraq görülməyə başlanmışdı. 11 sentyabr Nyu York və Vaşinqton hadisələrindən əvvəl Pentaqonun 2001-ci ildəki dörd illik müdafiə icmalında Müdafiə Nazirliyi Çini açıq şəkildə təhlükəsizlik məsələsində problem yarada biləcək ciddi bir rəqib kimi göstərmişdir. Bununla belə, 11 sentyabrdan sonra başlayan terrorizmlə mübarizə ABŞ üçün Soyuq müharibənin yerini aldı və Çin təhdidinə məhəl qoymamasına səbəb olmuşdu.

Hücumlardan sonra iki ölkə hökumətləri əməkdaşlıq etmək yolunu seçdi. Çin tərəfi antiterror koalisiyasına dəstək verəcəyinə və liberallaşma prosesini davam etdirəcəyinə dair güclü mesajlar vermişdi. 11 sentyabrdan sonra Çinin ABŞ-a dəstəyi, 2001-ci ildə Dünya Ticarət Təşkilatına (ÜTT) qəbul prosesi üçün yol açmış oldu. Beləliklə, Çin strateji sabitləyici və iqtisadi gücləndirici kimi yerini sağlamlaşdırmış oldu. Qlobal terrorizmə qarşı əməkdaşlıq siyasətinə əsasən Çinlə münasibətlərini yaxşı saxlamaq istəyən ABŞ, "Vahid Çin" prinsipini qəbul etdiyini və adanın Çinlə sülh yolu ilə yenidən birləşməsini dəstəklədiyini bildirmişdi. ABŞ-ın bu siyasət dəyişikliyinə səbəb olan bir amil də Rusiyanın Tayvan məsələsində, Çin tərəfində mövqe tutması və strateji ortaqlıq güdməsi olmuşdu (2). Lakin, Tayvan məsələsində ABŞ Çinlə razılaşmış görünsə də, sonradan Tayvana silah satmağa davam edərək, həm Tayvanın suverenliyinin qorunması, həm də Çini əhatə etmək siyasətindən əl çəkməyəcəyini göstərmiş oldu (3).

ABŞ-ı tarixinin ən canlı iqtisadi quruluşu və ən güclü ordusu olan halda təhvil alan Buş, 8 illik hakimiyyəti dövründə ölkəni maliyyə böhranı ilə demək olar ki, batmaq həddinə çatdırması ilə yanaşı, üstəlik Obamanı da yorğun və tükənmiş bir ordu ilə qarşı-qarşıya qoymuş oldu. Buş ABŞ-ın beynəlxalq imicinə də xələl gətirdi (4).

Obama vəzifəyə gəldikdə, Əl-Qaidəyə qarşı illərlə aparılan mübarizədə önəmli məsafə qət edə bilməmiş, təşkilatın lideri olan Üsamə bin Ladin hələ də ələ keçirilməmiş, Əfqanıstanda Əl-Qaidənin yenidən təşkilatlanmasına və Taliban qüvvələrinin də yenidən güclənməsinə əngəl ola bilməmiş bir ABŞ ilə qarşılaşmışdı.

Digər tərəfdən, İraq, hərbi istqamətdə dərhal həll edilməsi lazım olan bir problem olaraq qalmaqda davam edirdi. Buş dövründə olduqca problemli olan müttəfiqlərlə münasibətlər məsələsi yoluna qoyulmalı və möhkəmləndirilməli idi (5). Lakin Amerika imicinin ən çox ziyan gördüyü bölgə Yaxın Şərq idi. Əksəriyyəti müsəlman olan ölkələrdə antiamerikançılıq sürətlə artmışdı. Zədələnmiş Amerika imicini bərpa etmək və bu xalqların "ürəyini yenidən qazanmaq" yeni prezidentin xarici siyasətinə öz təsirini göstərmişdi (6).

Barak Obama 8 illik prezidentliyi müddətində 6 diplomatik prioritetə əsaslanırdı.

Birinci prioritet, xərclərə nəzarət etmək idi. ABŞ, George W.Bush-un dövründə apardığı iki müharibə üçün böyük xərc çəkmişdi.

İkinci prioritet, ABŞ iqtisadiyyatını dirçəltmək idi.

Üçüncü prioritet, terrorizmə qarşı mübarizəni davam etdirmək. Səlahiyyət dövründə əhəmiyyətli bir müvəffəqiyyət Üsamə bin Ladenin öldürülməsi idi, lakin İslam Dövlətinin yüksəlişi onun əvvəlki səylərinə kölgə saldı.

Dördüncü prioritet, nüvəsiz dünyanı təşviq etmək, iqlim dəyişikliyi, o cümlədən qlobal problemlərlə mübarizə aparmaq idi. İqlim dəyişikliyi ilə bağlı qlobal əməkdaşlıqdakı irəliləyiş, böyük ölçüdə Çinin dəstəyi ilə əlaqələndirilməlidir.

Beşinci prioritet, Buş tərəfindən ABŞ-ın zədələnmiş beynəlxalq nüfuzunu bərpa etmək və müttəfiqləri ilə əlaqələri gücləndirmək. Obama bu cəbhədə qismən müvəffəqiyyət əldə etdi. Kuba ilə diplomatik əlaqələrin bərpası Latın Amerikasında ABŞ-ın alqışlarını qazandı.

Altıncı və son prioritet, 200 ildir ki, Avropaya yönəlmiş olan bir istiqaməti Asiyaya və ya Atlantikdən Sakitə yönəldərək "Asiya Sakit okeanına qayıtmaq" strategiyası idi. ABŞ-ın Asiya-Sakit Okeana qayıtmaq üçün qlobal strategiyasını düzəltməsinin arxasında Çinin yüksəlişi dururdu.

Obama ilk dəfə "Asiyaya qayıtmaq" siyasətini təklif edəndə, Buş administrasiyasından bəzi rəsmilər etiraz etdilər. Əks reaksiyalar, siyasətin nəhayət "Asiya-Sakit Okean üçün tarazlıq" olaraq formalaşmasına səbəb oldu. Bu, əvvəllər Asiyada bir tarazlığın mövcud olduğunu, lakin Çinin yüksəlişi ilə pozulduğunu və bu səbəbdən ABŞ tərəfindən "balanslaşdırılması"nın lazım olduğunu nəzərdə tutan ağıllı bir ifadədir. Geriyə baxanda "Asiya-Sakit Okean ilə balanslaşma" strategiyasına uğur deyilə bilməz. Bu, nəinki Çinin yüksəlişinə mane ola bilmədi, eyni zamanda Çinin ABŞ-a olan maraqlarına zidd olan strateji inamsızlığı daha da artırdı. Donald Trump-ın prezident seçkilərində qalib gəlməsi ilə, "Asiyaya qayıt" siyasəti artıq ABŞ-ın Trans-Sakit okean siyasəti üçün "heç vaxt bitməyən bir layihə" halına gəldi (7).

Obamaya görə, Çin beynəlxalq sistemdəki bütün məsələlərdə və problemlərdə çox əhəmiyyətli bir rolu vardır. Prezident Obama, Çinin əhəmiyyətini vurğulayarkən və ABŞ-ın Çini qlobal bir güc olaraq qiymətləndirərkən, digər tərəfdən, Çinin artan iqtisadi gücü ilə paralel məsuliyyət götürməli olduğunu düşünürdü. Beləliklə, Obama, aprel 2009-cu ildə Londonda keçirilən G-20 zirvə toplantısında ilk dəfə görüşdüyü Çinin dövlət başçısı Hu Jintaoya bu düşüncələrini bildirmişdi. Beləliklə Obama rəhbərliyi, 2009-cu ildə ABŞ-ın Çinə olan strateji məqsədlərinin Çinə güvən aşılaması üçün çalışan və Çinin qlobal qurumların yenidən planlaşdırılmasında daha çox iştirakını ehtiva edən uzunmüddətli ABŞ-Çin münasibətləri üçün bir vizion hazırlamaq məqsədi daşıyırdı. Obamanın 2009-cu ilin noyabr ayında Çinə səfəri zamanı iki ölkə bu hədəfləri ortaq bir təbliğlə qəbul etdi (8).

2006-cı ildə Çin-Amerika təşəbbüsü olaraq qurulan "Strateji İqtisadi Dialoq" 2009-cu ildə Obama və Hu Jintao tərəfindən" ABŞ-Çin Strateji və İqtisadi Dialoqu" olaraq dəyişdirilmiş və məzmunu zənginləşdirilmişdir. Bu təşəbbüslə əhəmiyyəti artan ABŞ-Çin münasibətlərində üst səviyyədə hərtərəfli və birbaşa ünsiyyət təmin edilmiş, bu təşəbbüslə hər iki ölkə başçılarının da münasibətləri balanslı bir şəkildə davam etdirmələrinə, ortaq məqsədləri irəlilətmələrinə, fərqli fikirləri müzakirə etmələrinə və vacib qlobal problemləri həll etmələrinə şərait yaradırdı (9).

19 yanvar 2011-ci ildə Obama və Hu Jintao Ağ Evdə görüşmüşdülər. Bu görüş nəticəsində iki ölkə arasında 45 milyard dollarlıq ticarət müqaviləsi imzalandı (10).

Obamanın sürgündə olan Tibet dini lideri Dalay Lama ilə 2010-cu ilin fevralında görüşməsinin nəticəsi olaraq Çindən sərt reaksiya görmüşdü (11).

2012-ci ilin noyabrında Çinin dövlət başçısı Si Tsinpin olmuşdur və ilk Obama-Si əyani şəkildə görüşü iyun 2013-cü ildə Kaliforniyada həyata keçirilmişdi. Görüşdə İran və Suriyadakı mübahisələrə əlavə olaraq insan haqları və ticarət sahəsindəki mübahisəli məsələlərə toxunmaqdan daha çox görüşün ümumi məqsədi iki lider arasında şəxsi bağlantıların qurulması və Şimali Koreya məsələsi, iqlim və enerji təhlükəsizliyi kimi qlobal iqtisadi problemlərin müzakirə edilməsi kimi dəyərləndirilmişdir (12).

2014-cü ildə APEC zirvə toplantısında görüşən Obama və Xi iqlim dəyişikliyi ilə əlaqədar karbon emissiyalarının azaldılmasına dair ortaq tərəfdaşlıq sərgiləmişdilər. Əsas məqsəd 2015-ci ildə Parisdə keçirilən İqlim Dəyişikliyi Konfransında emissiyalarla bağlı yeni qlobal razılaşmanın müzakirəsinə dair impuls

formalaşdırmaq idi. Birgə mətbuat konfransında Obama, Çinlə “tarixi bir razılaşma”ya imza atdıqlarını və razılaşmanın ABŞ-Çin münasibətlərində əhəmiyyətli mərhələ olduğunu qeyd etmişdi(13).

Si Tsinpin, B.Obamanın dəvəti ilə 22-25 sentyabr 2015-ci ildə ABŞ-a səfər etmişdi. Əsas məqsəd, gərginliyi aradan qaldırmaq, qarşılıqlı hörmət və dinc yanaşı yaşamağın vacibliyini vurğulamaq idi (14). Bu görüşdən sonra iki tərəf, qarşılıqlı hörmət, qazanclı əlaqələr və əməkdaşlığa əsaslanan yeni ABŞ-Çin münasibətləri modelinin qurulması üçün səylərin artırılması, regional və qlobal əməkdaşlığın qorunması və inkişafı razılaşdırıldı.

## Nəticə

Obamanın iki dövrü ABŞ və Çin arasındakı güc nisbətində bərabərliyin yaxşılaşdığını gördü. 2016-cı ilin ortalarında Çinin real ÜDM-i ABŞ-dan 12% daha artıq idi. 2015-ci ilin sonunda, Çinin ümumi istehsal həcmi ABŞ-ın 150% -ni təmsil etdi ki, bu Çin tarixində görünməmiş bir rekord göstərici idi. Əksinə, ABŞ isə, 2008-ci il maliyyə böhranından bəri proqnozlaşdırılan ciddi bir islahat görmədi. Siyasətin məhdud roluna baxmayaraq, ABŞ və Çin kimi böyük güclər arasındakı münasibətlər əsasən hərtərəfli milli güclər ilə idarə olunur. Uğursuzluğa düçar olmuş “Asiya-Sakit okeanda tarazlıq” siyasətinə baxmayaraq, Çin ABŞ ilə nəinki arasına məsafə qoymadı, eyni zamanda Prezident Si Tsinpin tərəfindən Obama ilə görüşü zamanı təklif etdiyi “yeni bir böyük güc münasibətləri” konsepsiyasının nümunəsi olduğu kimi daha strateji təşəbbüs nümayiş etdirdi. Obama bu yeni tipli ikitərəfli münasibətlərin inşasını nə rədd etdi, nə də qəbul etdi. Eyni zamanda, Çin mövcudluğunu artırmağa və ABŞ-ın üstünlük təşkil etdiyi çərçivədə sözünü gücləndirməkdədir. Demək olar ki, Çin öz baxışını Çin-ABŞ münasibətləri xaricində qlobal miqyasda genişləndirdi. Əksinə, ABŞ Soyuq müharibə dövrü ilə müqayisədə strateji düşüncə baxımından əhəmiyyətli dərəcədə geriləmişdir. Çini özündə cəmləşdirmək üçün hazırlanmış “Asiya-Sakit okeanla tarazlıq” siyasəti də köhnə geopolitik düşüncəsinin davamı olaraq yaradıcılıqdan məhrum idi.

## Ədəbiyyat


1. https://www.ntv.com.tr/galeri/dunya/tarihteki-casus-ucak-krizleri,YNjn6Vv0xkiGWWO2vn2R9g
2. Emine Akçadağ Alagöz, Çin ile Amerika Arasında Var Olmaya Çalışan Bir Ada: Tayvan, BİLGESAM, 25 Mart 2010, http://www.bilgesam.org/incele/864/-cin-ile-amerika-arasinda-var-olmaya-calisan-bir-ada-tayvan /#. Wpgm3NQS9nI
3. İshak Turan, ABD-Çin İlişkileri Bağlamında Tayvan Sorunu, ss. 94.
4. Nuh Yılmaz, Obama 2009 Diplomasi Açılımı, 7 Şubat 2010, https://nuhyilmaz.com/2010/02/07/obama-2009-diplomasi-acilimi/
5. Gökhan Telatar, Barack Obama’nın Dış Politikasında Demokrasinin Yayılma Misyonu, Alternatif Politika, Cilt. 4, Sayı. 1, 54-83, Şubat 2012, s. 57-58.
6. Emine Akçadağ, ABD’nin Kamu Diplomasisi Stratejisi: Akıllı Güç..., www.kamudiplomasisi. org/pdf/ abdkds tratejisi.pdf
7. https://www.weforum.org/agenda/2016/12/america-china-relationship/
8. https://www.brookings.edu/research/establishing-credibility-and-trust-the-next-president-must-manage-americas-most-important-relationship/
9. https://thediplomat.com/2016/07/assessing-the-us-china-strategic-and-economic-dialogue/
10. Barış Ornarlı, 'Hu Ziyareti Olabildiğince Başarılı', Amerika’nın Sesi, 20 Ocak 2011, https://www. amerikaninsesi.com/a/hu-ziyareti-olabildiince-baarl-114309019/891726.html
11. Monika Chansoria, Obama's China Policy: Arranging for Engagement, CLAWS Journal, Summer 2011, pp. 99.
12. http://www.nbr.org/research/activity.aspx?id=345
13. http://time.com/3577820/apec-climate-change-barack-obama-xi-jinping-greenhouse-gas/
14. https://www.brookings.edu/opinions/obama-xi-meeting-more-fruitful-than-anticipated/


**Rəyçi: dos. T.Tağıyeva**

Göndərilib: 26.02.2021 Qəbul edilib: 02.03.2021

DOI: 10.36719/2663-4619/63/113-115

**Səbinə Eldəniz qızı Şirinova**
Bakı Dövlət Universiteti
magistrant
sabinashrinova@mail.ru

# SOSİAL TƏMİNAT HÜQUQU ÜZRƏ SOSİAL MÜAVİNƏTLƏRƏ DAİR QANUNVERİCİLİYİN TƏKMİLLƏŞDİRİLMƏSİ PRESPEKTİVLƏRİ

***Açar sözlər:*** *sosial təminat, vətəndaşların sosial müdafiəsinin gücləndirilməsi, sosial müavinətlər, sosial müavinətlərin inkişaf dinamikası, sosial müavinətlər üzrə qanunvericiliyin təkmilləşdirilməsi prespektivləri*

## The imrovement of social allowance perspectives on social security law

**Summary**

This article accounts for the idenfication of perspectives of the enhancement of the social law regarding the social assistance payments. Enhacing citizens' social welfare, creating the environment for the fulfillment of their material and spiritual needs and solving the issues related to the social security are the priorities of the social policy of the Republic of Azerbaijan. Over the recent years the successful uptrend of development has been maintained in all directions, the application of all social programmes, enhancement of citizens' social security, involving socially sensitive groups of citizens in the social care of the government, the security of their labor rights, the arrangement of active employment events and dedicated acts in other fields, pension and social distribution, the reforms regarding the enhancement of medical-social examination systems have been proceeded successfully. In this regard, we consider that some changes to the legislative statements regarding the social assistance payments should be done. As social assistance payments have a dynamic nature, regular enhancements on the legislative statements should be done.

***Key words:*** *social services, enforcement of citizen's social welfare, social assistance payments, the perspectives of enhancing the law regarding social assistance payments*

## Giriş

Azərbaycan Respublikası Konstitusiyasının 38-ci maddəsinə əsasən, hər kəsin sosial təminat hüququ vardır. (1, s. 8)

Sosial təminat hüququ onu ifadə edir ki, özünü saxlamaq qabiliyyətindən məhrum olmuş, yaxud başqalarına nisbətən cəmiyyətdə daha çox sosial müdafiəyə ehtiyacı olan şəxsin öz yaşayışını təmin etmək üçün dövlətdən müəyyən məbləğ əldə etmək haqqı vardır. Bu zaman fərdə əvəzsiz olaraq müəyyən məbləğdə pul vəsaiti və digər güzəştlər edilir. (8, s.5)

Azərbaycan Respublikasında vətəndaşların sosial müdafiəsinin gücləndirilməsi, onların maddi və mənəvi tələbatlarının ödənilməsi üçün zəruri şəraitin yaradılması, sosial məsələlərinin həlli sosial siyasətin prioritetlərindəndir.

Ötən illər ərzində Azərbaycanda bütün istiqamətlər üzrə uğurlu inkişaf dinamikası qorunub saxlanılmış, bütün sosial proqramların icrası, əhalinin sosial müdafiəsinin gücləndirilməsi, sosial cəhətdən həssas əhali qruplarının dövlət qayğısı ilə əhatə olunması, əmək hüquqlarının müdafiəsi, aktiv məşğulluq tədbirlərinin təşkili və digər sahələrdə məqsədyönlü işlər, pensiya və sosial-təminat, tibbi-sosial ekspertiza sistemlərinin təkmilləşdirilməsi yönündə islahat tədbirləri uğurla davam etdirilmişdir.

Sosial təminatın əsas növlərindən biri də sosial müavinətlərdir.

Sosial müavinətlərin tarixinə salsaq görərik ki, sosial təminatın bu növü hələ XX əsrin 20-ci illərinin II yarısından başlayaraq muzdlu işçilərə verilən sosial sığorta ödənişlərinin tərkib hissələrindən biri kimi meydana gəlmişdir. Buna baxmayaraq cəmiyyətdə yeni sosial-iqtisadi münasibətlərin yaranması sosial müavinətlərin yeni növlərinin meydana gəlməsi ilə nəticələndi (5, s. 464).

Sosial müavinətlər haqqında Azərbaycan Respublikasının qanunvericiliyi Azərbaycan Respublikasının Konstitusiyasından, Azərbaycan Respublikasının tərəfdar çıxdığı beynəlxalq müqavilələrdən, "Sosial müavinətlər haqqında" Azərbaycan Respublikasının Qanunundan və Azərbaycan Respublikasının digər qanunvericilik aktlarından ibarətdir.

Sosial müavinətlərə dair qanunvericilik aktlarının ikinci qrupunu beynəlxalq hüquqi aktlar, yaxud Azərbaycan Respublikasının tərəfdar çıxdığı beynəlxalq müqavilələr təşkil edir. Qeyd etmək lazımdır ki, ölkəmiz dövlət müstəqilliyini bərpa etdikdən sonra bir çox beynəlxalq təşkilatların (Birləşmiş Millətlər Təşkilatının, Beynəlxalq Əmək Təşkilatının, Avropa Şurasının və s.) bərabər hüquqlu üzvü olmuşdur.

Müavinət təminatına dair həmin təşkilatların Azərbaycan Respublikası tərəfindən ratifikasiya edilmiş normativ aktları (konvensiyalar, tövsiyələr və s.) da sosial müavinətlər institutunun mənbələrinə daxil edilir (məsələn, Birləşmiş Millətlər Təşkilatının "Uşaq hüquqları haqqında" Konvensiyası, Beynəlxalq Əmək Təşkilatının "Əlillərin peşə reabilitasiyası və məşğulluğu haqqında" Konvensiyası,"Analığın mühafizəsi haqqında" Konvensiyası və s.).

Azərbaycan Respublikası dövlət müstəqilliyini bərpa etdikdən sonra müavinət təminatına dair çoxsaylı normativ hüquqi aktlar qəbul olunmuş, onun bir çox yeni növləri müəyyən edilmişdir. Lakin 01 yanvar 2006-cı ilə qədər ölkəmizdə sosial müavinətlərlə bağlı münasibətlər müxtəlif qanunvericilik aktları ilə tənzimlənmiş, bu sahədə vahid normativ akt mövcud olmamışdır. Sosial təminat sisteminin təkmilləşdirilməsi məqsədilə 07 fevral 2006cı ildə "Əmək pensiyaları haqqında" və "Sosial müavinətlər haqqında" Azərbaycan Respublikası Qanunları qəbul olunmuşdur. Beləliklə, 01 yanvar 2006-cı ildən etibarən ölkəmizdə sosial müavinətlərin təyin olunması və verilməsinin hüquqi əsasları, eləcə də bu sahədə yaranan digər münasibətlər "Sosial müavinətlər haqqında" Azərbaycan Respublikası Qanunu ilə tənzimlənir.

Sosial təminat hüququ üzrə sosial müavinətlərə dair qanunvericiliyin təkmilləşdirilməsi prespektivləri müəyyən edilməlidir. Bununla bağlı olaraq sosial müavinətlərə dair qanunvericilik aktlarında bəzi zəruri düzəlişlər edilməlidir.

Belə ki, «Sosial müavinətlər haqqında» Qanunda ilk dəfə olaraq sosial müavinətə leqal anlayış verilmişdir. Həmin qanunun 1-ci maddəsinə görə, sosial müavinətlər dedikdə qanunla müəyyən edilmiş qaydada ayrı-ayrı kateqoriya şəxslərə sosial yardım göstərilməsi məqsədilə aylıq və ya birdəfəlik ödənilən pul vəsaiti başa düşülür. (2, s.1) Lakin M.N.Əliyevin qeyd etdiyi kimi, qanunvericilik sosial təminatın bu növünün təqdim edilməsi məqsədini sosial sığorta ilə əlaqələndirməmiş və onun əsas məqsədini göstərə bilməmişdir. Fikrimizcə, M.N.Əliyevin həmin mülahizələrdən çıxış edərək sosial müavinətlərə verdiyi anlayışı düzgün hesab etmək olar və sosial müavinətlərə belə bir təkminləşmiş anlayış vermək olar: "sosial təminat sistemi üzrə sosial müavinətlər dedikdə qanunla nəzərdə tutulmuş hallarda və qaydada tam və ya qismən itirilmiş əmək haqqını və ya gəlirləri kompensasiya etmək, həm də əlavə maddi yardım göstərmək məqsədilə müəyyən kateqoriya şəxslərə aylıq, dövri və birdəfəlik təyin olunan pul ödənişləri başa düşülür (6, s. 96-101).

"Sosial sığorta haqqında" Azərbaycan Respublikası Qanunun 6-cı maddəsinə əsasən, əmək qabiliyyətinin müvəqqəti itirilməsinə görə müavinət və hamiləliyə və doğuma görə müavinət almaq hüququ ən azı 6 ay sosial sığorta stajı olan şəxslərə şamil edilir. (3, s. 5)

"Məcburi dövlət sosial sığortası üzrə ödəmələrin və əmək qabiliyyətini müvəqqəti itirmiş işçilərə sığortaedənin vəsaiti hesabına ödənilən müavinətin hesablanması və ödənilməsi haqqında" Əsasnamənin 25-ci bəndinə əsasən, əmək qabiliyyətinin müvəqqəti itirilməsinə görə müavinət 6 ay sosial sığorta stajı olmayan şəxslərə şəxslərə şamil edilmir. (4, s. 10)

Hesab edirik ki, əmək qabiliyyətinin itirilməsinə eləcə də, hamiləliyə və doğuşa görə 6 ay staj qoyulması Azərbaycan Respublikası Konstitusiyasının 38-ci maddəsinin 3-cü hissəsi ilə ziddiyyət təşkil edir. Azərbaycan Respublikası Kontitusiyasının 38-ci maddəsinin 3-cü hissəsinə əsasən, hər kəs qanunla müəyyən edilmiş yaş həddinə çatdıqda, xəstəliyinə, əlilliyinə, ailə başçısını itirdiyinə, əmək qabiliyyətini itirdiyinə, işsizliyə görə və qanunla nəzərdə tutulmuş digər hallarda sosial təminat hüququna malikdir. Buna görə də hesab edirik ki, "Sosial sığorta haqqında" Azərbaycan Respublikası Qanunun 6-cı maddəsində, eləcə də, "Məcburi dövlət sosial sığortası üzrə ödəmələrin və əmək qabiliyyətini müvəqqəti itirmiş işçilərə sığortaedənin vəsaiti hesabına ödənilən müavinətin hesablanması və ödənilməsi haqqında" Əsasnamənin zəruri bəndlərində əsaslı dəyişikliklər edilməlidir.

Məcburi dövlət sosial sığortasına cəlb edilməyən qadınlara hamiləliyə və doğuma görə, eləcədə uşağa qulluğa görə müavinətin verilməməsi. Uşaqların yaşamaq və sağlamlıq hüquqlarının daha etibarlı müdafiəsi baxımından məcburi dövlət sosial sığortasına cəlb edilməyən qadınlara da hamiləliyə və doğuma görə, eləcədə uşağa qulluğa görə müavinətin müəyyən edilməsi bağlı sosial müvinətlərə dair qanunvericiliyə dəyişikliyin edilməsi məqsədəuyğun olardı.

Belə ki, bir yaş yarımadək uşağa qulluğa görə - 44 manat, uşağın bir yaş yarımdan üç yaşınadək qulluğa görə isə - 28 manat məbləğində müəyyənləşdirilmişdir. Lakin 2021-ci ildə respublikamızda uşaqların yaşayış minimumu 175 manat həddində müəyyən edilmişdir. Bu da kifayət qədər fərqin və ziddiyyətin olduğunu göstərir. Bu məbləğin yaşayış minimumu həddinə çatdırılması məqsədəuyğun olar. Bu müqayisəni bir yaşınadək uşağı olan aztəminatlı ailələrə verilən və uşağın anadan olmasına görə birdəfəlik müavinətlər üzrə də aparmaq olar.

"Sosial müavinətlər haqqında" Azərbaycan Respublikasının Qanununda sağlamlıq imkanları məhdud 18 yaşınadək uşaqlara münasibətdə müəyyən edilmiş müavinətin təyinat məqsədi onların sağlamlıq imkanlarının məhdudluğunun yaratdığı çətinliklərin həllinə dəstək verilməsi üçün maddi təminatıdır. Ailə

başçısının vəfatı ailə üçün əlavə maddi çətinliklər yaşatdığı üçün "Sosial müavinətlər haqqında" Azərbaycan Respublikasının 2019-cu il 29 noyabr tarixli 1703-VQD nömrəli Qanunu ilə sözügedən qanuna edilmiş dəyişikliklə onların həmin müavinəti ailə başçısını itirməyə görə müavinətlə yanaşı almaq hüququ müəyyən edildi. Lakin ailə başçısının kifayət qədər sosial sığorta stajı olması səbəbindən ailənin əmək pensiyası hüququ yarandığı halda sağlamlıq imkanlarının məhdudluğu səbəbindən təyin edilmiş müavinətin ödənilməsi dayandırılır. Bu da həmin kateqoriya şəxslərin,ümumilikdə ailənin maddi təminatının aşağı düşməsinə və haqlı narazılıqlarına səbəb olur. Məsələn, şəxsin ailə başçısını itirməyə görə pensiya hüququ yaranmırsa, o, həm 150 manat məbləğində sağlamlıq imkanlarının məhdudluğuna görə, 80 manat da ailə başçısını itirməyə görə olmaqla, ümumilikdə 230 manat müavinət alır. Lakin pensiya hüququ yarandığı halda, məsələn, 200 manat pensiya təyin edilir və sağlamlıq imkanlarının məhdudluğuna görə təyin edilmiş müavinətin ödənişi dayanır. Bu hal, ailədə 2 və daha artıq şəxsin ailə başçısını itirməyə görə pensiya hüququnun yaranması halında sağlamlıq imkanları məhdud şəxsə təyin ediləcək sosial ödənişin (pensiyanın) kifayət qədər aşağı məbləğdə müəyyən edilməsinə səbəb olacaqdır. Sağlamlıq imkanları məhdud 18 yaşınadək uşağa müavinət digər sosial ödənişlərdən asılı olmayaraq təyin edilməli, bununla əlaqədar qanunda zəruri dəyişikliklər həyata keçirilməlidir.

## Nəticə

Beləliklə, bu nəticəyə gələ bilərik ki, "Sosial müavinətlər haqqında" Azərbaycan Respublikasının qanunvericiliyi Azərbaycan Respublikasının Konstitusiyasından, Azərbaycan Respublikasının tərəfdar çıxdığı beynəlxalq müqavilələrdən, bu Qanundan və Azərbaycan Respublikasının digər qanunvericilik aktlarından ibarətdir. 2006-cı ilə qədər respublikamızda sosial müavinətlərlə bağlı vahid normativ akt mövcud olmamış, bu məsələ müxtəlif qanunvericilik aktları ilə tənzimlənmişdir. 7 fevral 2006-cı il tarixli "Sosial müavinətlər haqqında" Azərbaycan Respublikasının Qanunu qəbul olunduqdan sonra sosial müavinətlərin təyin edilməsi və verilməsinin hüquqi əsasları, eləcə də, bu sahədə yaranan digər münasibətlər adıçəkilən qanunla tənzimlənməyə başlanmışdır. Azərbaycan Respublikası sosial müavinətlər sisteminin təkmilləşdirilməsi üzrə daim beynəlxalq təşkilatların aktlarını, Azərbaycan Respubliksının tərəfdar çıxdığı beynəlxalq müqavilələrin (məsələn, Birləşmiş Millətlər Təşkilatının "Uşaq hüquqları haqqında" Konvensiyası, Beynəlxalq Əmək Təşki-latının "Əlillərin peşə reabilitasiyası və məşğulluğu haqqında" Konvensiyası, "Analığın mühafizəsi haqqında" Konvensiyası və s.) müddəalarını rəhbər tutur, qanunvericilik bazasını onlara uyğunlaşdırmağa çalışır. Ölkəmizdə sosial müdafiə proqramları əhatəli və intensivdir, çünki Prezidentimiz cənab İlham Əliyevin nitqi ilə desək, "Azərbaycan Respublikasının siyasətinin mərkəzində Azərbaycan vətəndaşı dayanır".

## Ədəbiyyat

1. Azərbaycan Respublikasının Konstitusiyası, 12 noyabr 1995-ci il, s.8
2. Sosial müavinətlər haqqında» Azərbaycan Respublikasının qanunu, Bakı şəhəri,07 fevral 2006-cı il s.1
3. Sosial sığorta haqqında" Azərbaycan Respublikasının qanunu, Bakı şəhəri, 18 fevral 1997-ci il, s.4
4. Azərbaycan Respublikası Nazirlər Kabinetinin 15 sentyabr 1998-ci il tarixli 189 nömrəli qərarı ilə təsdiq edilmiş «Məcburi dövlət sosial sığorta ödəmələrinin və əmək qabiliyyətini müvəqqəti itirmiş işçilərə sığortaedənin vəsaiti hesabına ödənilən müavinətlərin hesablanması və ödənilməsi haqqında» Əsasnamə, Bakı şəhəri, 15 sentyabr 1998-ci il, s. 10
5. Əliyev M.N. Sosial təminat hüququ: Dərslik. Bakı: Adiloğlu, 2007, s.464
6. Əliyev M.N. Müavinətlərin anlayışı, təsnifatı və onun məbləğinin müəyyən edilməsi metodları / Keçid dövründə Azərbaycan Respublikasında dövlət və hüquq qurulucuğunun aktual problemləri. Elmi məqalələr məcmuəsi. 10-cu buraxılış. Bakı: Səda, 2004, s.96 -101
7. Əliyev M.N., Mürşüdov R.I. «Sosial müavinətlər haqqında» Azərbaycan Respublikası Qanununun elmi və praktiki kommentariyası. Bakı: Ilay, 2008
8. Батыгин К.С., Гадаганов В.П. Пособие по социальному обеспечению. М.: Академия труда и социальных отношений, 1996, s.5

**Rəyçi: prof. M.Əliyev**

Göndərilib: 21.02.2021 Qəbul edilib: 24.02.2021

DOI: 10.36719/2663-4619/63/128-131

**Aysel Ceyhun qızı Qasımova**
Bakı Dövlət Universiteti
magistrant
ayselqasimova127@gmail.com

# AZƏRBAYCAN RESPUBLİKASINDA PARLAMENT SEÇKİLƏRİNİN HÜQUQİ ƏSASI

***Açar sözlər:*** *seçkilər, seçki hüququ, majoritar seçki sistemi, seçici imzası, seçki komissiyası.*

## Legal basis of parliamentary elections in the Republic of Azerbaijan

**Summary**

As in other democratic states, parliamentary elections are the most regular form of citizen participation in the management of the state and public life in the Republic of Azerbaijan. Also, parliamentary elections are a mechanism that ensures the transparency of state power and facilitates the legalization of this area. The democratic and free conduct of elections, which is an expression of people's will, depends on the socio-political stability in the country and the existence of norms that legally regulate the conduct of these elections. In this sense, the Constitution of the Republic of Azerbaijan and the Election Code are the main acts regulating election law relations. These legal acts create methods for the democratic conduct of elections, including parliamentary elections in the Republic of Azerbaijan,

***Key words:*** *elections, suffrage, majoritarian election system, voter signature, election commission.*

## Giriş

12 noyabr 1995-ci il tarixində qəbul edilmiş Konstitusiyamızın 1-ci maddəsinə əsasən, Azərbaycan Respublikasında dövlət hakimiyyətinin yeganə mənbəyi Azərbaycan xalqıdır. Bu maddədən göründüyü kimi dövlət hakimiyyətinin əsasını xalqın iradəsi təşkil edir. Xalqın iradəsi isə ümumi, bərabər, birbaşa seçki hüququ əsasında sərbəst, şəxsi və gizli səsvermə yolu ilə keçirilən demokratik seçkilərdə öz əksini tapır. Ümumiyyətlə, hüquqi dövlətin əsas əlamətlərindən biri, məhz dövlət hakimiyyəti orqanlarının seçkilər yolu ilə formalaşdırılmasıdır və bu xüsusiyyət Azərbaycan üçün də xarakterikdir.

Bildiyiniz kimi müstəqillik əldə etdikdən sonra hakimiyyətlərin bölünməsi prinsipi ilə idarə olunan Azərbaycan Respublikasında qanunvericilik hakimiyyəti parlament tərəfindən həyata keçirilir. Müxtəlif dövlətlərdə fərqli adlanan bu orqan Azərbaycan Respublikasında Milli Məclis adı ilə fəaliyyət göstərməkdədir. Xalq tərəfindən seçilmiş 125 deputatdan ibarət olan Milli Məclis ən əsas və aparıcı dövlət orqanlarından biri hesab edilir.

Hər bir parlament, o cümlədən Azərbaycan Respublikasının Milli Məclisi müəyyən müddətə seçilir. Tərkibi yeniləşməyən parlament diktatordan yalnız özünün say tərkibinə görə fərqlənir. Parlamentin yeniləşməsi müəyyən məqsədlə bağlıdır. Birincisi, parlamentin bürokratikləşməsinin və cəmiyyətdən aralanmasının qarşısı alınır. İkincisi, vaxtaşırı cəmiyyətin yeni fikir və ideylarmı özündə cəmləyən, yeni sosial maraqları əks etdirən insanlar parlamentə daxil olur, yəni parlamentin cəmiyyətdəki maraqları adekvat əks etdirməsi və zamanla onun uyğunlaşması təmin edilir. Üçüncüsü, artıq seçici korpusu üçün arzuolunmaz şəxslər parlamentdən kənarlaşdırılır. (3)

Azərbaycan Respublikasında parlament seçkiləri ilə bağlı yaranan hüquq münasibətləri Konstitusiya, qanunlar və digər normativ hüquqi aktlarla tənzimlənir. Konstitusiyamızın 83-cü maddəsində qeyd olunur ki, Azərbaycan Respublikası Milli Məclisinin deputatları majoritar seçki sistemi üzrə, ümumi, bərabər və birbaşa seçki hüququ əsasında sərbəst, şəxsi və gizli səsvermə yolu ilə seçilirlər.

Parlament seçkilərinin müntəzəm olaraq keçirilməsi isə Konstitusiyanın 84-cü maddəsində öz əksini tapmışdır. Belə ki, həmin maddəyə görə Azərbaycan Milli Məclisinin hər çağırışının səlahiyyət müddəti 5 ildir. Müharibə şəraitində hərbi əməliyyatların aparılması Azərbaycan Respublikasının Milli Məclisinə seçkilərin keçirilməsini mümkün etmədikdə Azərbaycan Respublikası Milli Məclisinin çağırışının səlahiyyət müddəti hərbi əməliyyatların sonunadək uzadılır. Bu barədə qərar seçkilərin keçirilməsini təmin edən dövlət orqanının müraciətinə əsasən Azərbaycan Respublikasının Konstitusiya Məhkəməsi tərəfindən qəbul edilir. Azərbaycan Respublikası Milli Məclisinin hər çağırışının seçkiləri hər beş ildən bir noyabr ayının birinci bazar günü keçirilir. Azərbaycan Respublikası Milli Məclisinin deputatlarının səlahiyyət müddəti Azərbaycan Respublikası Milli Məclisinin çağırışının səlahiyyət müddəti ilə məhdudlaşır. Deputatlıqdan çıxanların yerinə yeni seçkilər keçirilərsə, yeni seçilən deputatın səlahiyyət müddəti deputatlıqdan çıxanın qalan səlahiyyət müddəti ilə məhdudlaşır.

Konstitusiyamızda deputatlığa namizədlər üçün irəli sürülən tələblər də əks olunmuşdur:

I. Azərbaycan Respublikasının seçkilərdə iştirak etmək hüququna malik olan hər bir vətəndaşı qanunla müəyyən edilmiş qaydada Azərbaycan Respublikası Milli Məclisinin deputatı seçilə bilər.

II. İkili vətəndaşlığı olan, başqa dövlətlər qarşısında öhdəliyi olan, icra və ya məhkəmə hakimiyyəti sistemlərində qulluq edən, elmi, pedaqoji və yaradıcılıq fəaliyyəti istisna olmaqla, başqa ödənişli fəaliyyətlə məşğul olan şəxslər, din xadimləri, fəaliyyət qabiliyyətsizliyi məhkəmə tərəfindən təsdiq edilən, ağır cinayətlərə görə məhkum olunmuş şəxslər, məhkəmənin qanuni qüvvəyə minmiş hökmü ilə azadlıqdan məhrumetmə yerlərində cəza çəkən şəxslər Azərbaycan Respublikasının Milli Məclisinə deputat seçilə bilməzlər. (1)

Parlament seçkiləri ilə bağlı başlanğıc müddəalar Konstitusiyamızda təsbit olunsa da, bu qəbildən olan hüquq münasibətlərinin əksəriyyəti sahəvi qanunlarla tənzimlənir. Azərbaycan Respublikasında demokratik prinsiplərə əsaslanan, seçki hüququ sahəsində dünyanın demokratik dövlətlərinin təcrübəsində sınaqdan çıxmış müddəaları təsbit edən yeni seçki sisteminin əsası məhz 12 avqust 1995-ci il tarixli «Azərbaycan Respublikası Milli Məclisinə seçkilər haqqında» Azərbaycan Respublikasının 1082 saylı Qanunu ilə qoyulmuşdur. 5 iyul 2000-ci ildə yenidən «Azərbaycan Respublikası Milli Məclisinə seçkilər haqqında» Azərbaycan Respublikasının Qanunu, nəhayət, 27 may 2003-cü ildə Azərbaycan Respublikasının Seçki Məcəlləsi qəbul olundu. 1995-ci il «Milli Məclisə seçkilər haqqında» Azərbaycan Respublikası Qanunundan Azərbaycan Respublikasının Seçki Məcəlləsinə qədər ciddi bir təkamül yolu keçmiş respublikamızın seçki qanunvericiliyi kifayət qədər təkmilləşdirilmiş, seçki prosesinin ayrı-ayrı mərhələlərində həyata keçirilən hər bir seçki hərəkətinin dəqiqliyi ilə tənzimini nəzərdə tutan müddəalar seçki qanunvericiliyində öz əksini tapmışdır. Bu zaman dünya dövlətlərinin bu sahədə olan təcrübəsindən, beynəlxalq standartlardan, habelə beynəlxalq təşkilatların, o cümlədən Avropa Şurası Venesiya Komissiyasının tövsiyələrindən istifadə olunmuşdur. (5)

Göründüyü kimi hal-hazırda Seçki Məcəlləsi Azərbaycan Respublikasında keçirilən seçkilər, o cümlədən parlament seçkiləri ilə bağlı əksər məsələləri tənzimləyən əsas normativ hüquqi akt hesab olunur. Belə ki, müvafiq məcəllənin 5-ci bölməsi "Milli Məclisə seçkilər" adlandırılmaqla özündə 7 fəsli ehtiva edir və burada əks olunmuş normalar seçkilərin təyin olunması, deputatlığa namizədlərin irəli sürülməsi, seçkilərə hazırlıq və onların keçirilməsi, seçkilərin yekunları, deputatın mandatdan məhrum edilməsi, əlavə seçkilərin keçirilməsi və s. kimi bir çox məsələləri nizamlayır.

Seçki Məcəlləsinin tələbinə əsasən parlament seçkilərini Azərbaycan Respublikasının Mərkəzi Seçki Komissiyası (MSK) təşkil edir və yekunlaşdırır. Seçkilərin nəticələrinin düzgünlüyünü isə qanunla müəyyən edilmiş qaydada Konstitusiya Məhkəməsi yoxlayır və təsdiq edir.

Parlament seçkilərinə namizədlər birmandatlı seçki dairələri üzrə irəli sürülürlər. Namizədlər seçki dairəsində daimi yaşayan, seçki hüququ olan Azərbaycan vətəndaşları, namizədin öz təşəbbüsü ilə və ya bilavasitə seçicilər tərəfindən irəli sürülürlər. Seçki Məcəlləsinin 53.1-ci maddəsinə əsasən namizəd öz təşəbbüsü ilə və ya aktiv seçki hüququ olan seçicilər tərəfindən o şərtlə irəli sürülə bilər ki, ərazisində namizədin dəstəklənməsi üçün zəruri olan imzaların yığıldığı və namizədin qeydə alınmasının nəzərdə tutulduğu müvafiq seçki komissiyasına bu barədə bildiriş göndərilsin. (6)

Milli Məclisə seçkilər zamanı namizədlərin müdafiəsi üçün onun irəli sürüldüyü seçki dairəsinin ərazisində seçici imzası toplanmalıdır. Müvafiq seçki komissiyası tərəfindən imza vərəqələri və namizədin qeydə alınması üçün lazım olan digər sənədlər qəbul edildikdən sonra 7 gün müddətində namizədin qeydə alınıb-alınmaması barədə əsaslandırılmış qərar qəbul edilməlidir. Qeydə alınmış namizədlərin fəaliyyəti Seçki Məcəlləsininin 69-71-ci maddələri ilə tənzimlənir. Qeydə alınmış bütün namizədlər onların statusları nəzərə alınmaqla bərabər hüquqa malik olub, bərabər vəzifələr daşıyırlar. Onların hər birinə qeydiyyat vəsiqəsi verilir. Konstitusiyanın 47-ci maddəsinin tələbinə və Seçki Məcəlləsinə uyğun olaraq səsverməyə 23 gün qalmış deputat seçkilərində iştirak etmək üçün qeydə alınmış namizədlər, namizədi qeydə alınmış siyasi partiyalar, siyasi partiyalar bloku seçkiqabağı təbliğat və təşviqat fəaliyyətinə başlayır. Səsvermə gününə 24 saat qalmış təbliğat və təşviqat kampaniyası dayandırılır. Səsvermə gününə 24 saat qalmış və səsvermə günü təşviqat və təbliğat aparılması qadağandır.

Seçkiqabağı təşviqat kütləvi informasiya vasitələri ilə, yığıncaqlar, vətəndaşlarla görüşlər, kütləvi müzakirələr, söhbətlər və s. formada kütləvi tədbirlərin keçirilməsi yolu ilə, o cümlədən çap olunmuş, audiovizual və digər təşviqat materiallarının buraxılması və yayılması yolu və qanunla qadağan edilməyən digər üsullarla aparıla bilər.

Seçkilərin gedişinə qanunsuz müdaxilə etmək qadağandır. Bu müddəa Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin 25 oktyabr 2005-ci il tarixli, "Azərbaycan Respublikasının Milli Məclisinə seçkilərin hazırlanması və keçirilməsi ilə bağlı təxirəsalınmaz tədbirlər haqqında" sərəncamında və Seçki Məcəlləsində nəzərdə tutulmuşdur.

Seçkilər günü səsvermə saat 8-dən 19-a kimi keçirilir. Məntəqə seçki komissiyaları səsvermə gününə azı 25 gün qalmış səsvermənin yeri və vaxtı haqqında kütləvi informasiya vasitələri ilə və ya məlumat lövhələri vasitəsi ilə seçiciləri xəbərdar etməlidirlər.

Seçkilər günü saat 7.50-də məntəqə seçki komissiyasının sədri seçki məntəqəsini açıq elan edir, seçki komissiyasının üzvlərinə, orada olan seçicilərə, müşahidəçilərə boş seçki qutularını göstərib kilidləyir, saat 8.00-da səsvermənin başlandığını elan edir. Hər bir seçici şəxsən və təklikdə səs verir. Başqa şəxslərin əvəzinə səs verməyə icazə verilmir. Seçki bülleteni seçicidən başqa heç kəsin daxil olmasına icazə verilməyən, gizli səsvermə üçün xüsusi avadanlıqla təchiz edilmiş otaqda və ya kabinədə doldurulur. Seçki bülletenini müstəqil yazıb doldurmaq imkanı olmayan əlilliyi olan seçici, məntəqə seçki komissiyasının üzvlərindən və müşahidəçilərdən başqa, istədiyi şəxsi kömək üçün otağa və ya kabinəyə çağıra bilər. Bu şəxsin soyadı və inisialı seçicilər siyahısında seçki bülleteni alınması barədə seçicinin imzası ilə birgə göstərilir. Seçici doldurulmuş seçki bülletenini səsvermə üçün nəzərdə tutulmuş seçki qutusuna salır.

Səsvermə müddəti başa çatdıqda məntəqə seçki komissiyasının sədri ucadan elan edir ki, «yalnız seçki bülleteni almış və səsvermə otağında olan seçicilər səs verə bilərlər». Bu zaman təmin olunmalıdır ki, yalnız bu elanadək səsvermə otağında növbəyə dayanmış seçicilər səs versinlər. Seçki qutuları açılmamışdan əvvəl, istifadə edilməmiş seçki bülletenləri səsvermə otağındakı müşahidəçilərin müşahidəsi ilə məntəqə seçki komissiyasının üzvləri tərəfindən sayılır və ləğv edilir. Həmin seçki bülletenlərinin sayı elan edilir və səsvermənin yekun protokolunda qeyd olunur. Seçki bülleteni almış seçicilərin imzalarının sayı səsvermənin yekun protokoluna daxil edilir. Eyni zamanda, səsvermə vəsiqəsi ilə səs verən və ayrıca seçki məntəqəsindən kənarda, daşınan seçki qutusundan istifadə etməklə səs verən seçicilərin sayı yekun protokolunda göstərilir. Bundan sonra məntəqə seçki komissiyasının sədri seçki qutularının kilidlərinin (daşınan seçki qutusunda isə həmçinin yarığın üzərindəki möhürün) salamatlığını yoxlayır, məntəqə seçki komissiyasının üzvlərini və müşahidəçiləri bununla əyani surətdə tanış edərək seçki qutularını açır.

Seçki qutuları növbə ilə açılır: əvvəlcə daşınan seçki qutusu, sonra isə daşınmaz seçki qutuları. İlk növbədə daşınan seçki qutusundakı bülletenlər sayılır. Onların sayı səsvermə otağından kənarda səs verilməsi üçün seçicilərin verdikləri ərizələrin sayından çox olmamalıdır. Daşınan seçki qutusu üzrə səslər hesablanarkən bülletenlərin ümumi sayı verilmiş ərizələrin sayından (bülleten alan seçicilərin ümumi sayından) çox olarsa, daşınan seçki qutusundakı bütün səslər məntəqə seçki komissiyasının qərarı ilə etibarsız sayılır. Bu barədə akt səsvermə otağından kənarda səsvermənin keçirilməsini təmin edən məntəqə seçki komissiyası üzvlərinin soyadları göstərilməklə səsvermənin yekun protokoluna əlavə olunur. [2]

Dairə Seçki Komissiyasında (DSK) səslərin hesablanması Seçki Məcəlləsinin 107-ci maddəsinə uyğun aparılır və səsvermə günündən ən geci 2 gün keçənədək DSK seçkilərin yekunlarını müəyyən edir. Seçkilərdə iştirak edən seçicilərin ən çox səsini toplamış namizəd deputat seçilmiş hesab edilir.

Seçki Məcəlləsinin 171.2-ci maddəsinə uyğun olaraq, MSK DSK-lardan daxil olmuş protokolları səsvermə günündən ən geci 20 gün keçənədək yoxlayır, 48 saat müddətində Konstitusiya Məhkəməsinə təqdim edir. Konstitusiya Məhkəməsi seçkilərə dair sənədləri aldıqdan sonra 10 gün müddətində müvafiq mütəxəssisləri cəlb etməklə həmin sənədlərin Seçki Məcəlləsinə uyğunluğunu yoxlayır, DSK-ların protokolları Seçki Məcəlləsinin tələblərinə cavab verdikdə seçkilərin yekunlarını təsdiq edir. Konstitusiya Məhkəməsinin qərarı qətidir.

Seçki Məcəlləsinin tələbinə əsasən, DSK seçkilərin yekunları haqqında protokolu imzaladıqdan sonra deputat seçilmiş namizədə dərhal bu barədə məlumat verir. Deputat seçilmiş namizədlər ən geci 60 gün müddətində deputat statusu ilə bir araya sığmayan və Konstitusiyanın 85-ci maddəsinin II hissəsində göstərilən vəzifədən azad olunduqları barədə əmrin surətini və ya fəaliyyətlərinə xitam verilməsi barədə öhdəliyi nəzərdə tutan ərizəni MSK-ya təqdim edirlər.

Seçkilərin ümumi yekunları rəsmi dərc edildikdən sonra namizəd deputat statusu ilə bir araya sığmayan vəzifədən azad olunduqda və ya fəaliyyətinə xitam verdikdə MSK onu deputat kimi qeydə alır və həmin şəxsə deputat vəsiqəsi verir. Nəhayət, MSK seçki dairələri üzrə səsvermənin nəticələrini ümumiləşdirərək cədvəl şəklində dərc edir və həmin məlumatlar MSK-nın internet səhifəsində yerləşdirilir. [6]

## Nəticə

Göründüyü kimi Azərbaycan Respublikasında keçirilən parlament seçkilərinin hər mərhələsi qanunvericiliyimizdə detallı şəkildə təsbit olunmuşdur və bu sahədə müvafiq normaların pozulması məsuliyyətin yaranmasına səbəb olur. Seçki ilə bağlı münasibətlərin hüquqi cəhətdən təzimlənməsi və bu sahədə hüquq pozuntusu olduğu halda, məsuliyyət tədbirlərinin tətbiq olunması ölkədə keçirilən seçkilərin şəffaf, qanuni olmasından xəbər verir. Bu gün ölkəmizdə vətəndaşların seçki hüquqları yüksək səviyyədə təmin olunur, həmçinin seçkilərin azad və sərbəst şəkildə realizəsi üçün hər bir imkan yaradılır.

**Ədəbiyyat**

1. Azərbaycan Respublikası Konstitusiyası. "Hüquq Yayın Evi", Bakı, 2018, 92 s.
2. Azərbaycan Respublikasının Seçki Məcəlləsi. http://e-qanun.az/code/17 .
3. Əsgərov Z.A. Konstitusiya hüququ. Dərslik, Bakı: Bakı Universiteti Nəşriyyatı, 2011, 760 s.
4. Əliyev S.F. Şükürov N.H. Parlament hüququ, Dərslik, Bakı: Qanun nəşriyyatı, 2015, 328 s.
5. Nəsirov E.H. "Azərbaycan Respublikası Milli Məclisinə seçkilərin hüquqi tənziminin bəzi problem məsələləri". Bakı Universitetinin xəbərləri. 2015.
6. http://www.anl.az/down/meqale/azerbaycan/2010/avqust/131203.htm.

**Rəyçi: dos. N.Şükürov**

Göndərilib: 22.02.2021 Qəbul edilib: 24.02.2021

DOI: 10.36719/2663-4619/63/132-135

**Sahil İlqar oğlu Cəfərov**
Bakı Dövlət Universiteti
magistrant
sahil.jafarov@outlook.com

# MÜASİR DÖVRDƏ AZƏRBAYCAN RESPUBLİKASINDA HƏYATA KEÇİRİLƏN MƏHKƏMƏ-HÜQUQ İSLAHATLARININ MƏHKƏMƏ SİSTEMİNİN İNKİŞAFINA TƏSİRİ

***Açar sözlər:*** *məhkəmə-hüquq islahatları, məhkəmə hakimiyyəti, məhkəmə sistemi, ədalət mühakiməsi, məhkəmə icraatının effektivliyi*

## The impact of judicial-legal reforms implemented in the Republic of Azerbaijan in modern times on the development of the judicial system

**Summary**

In modern times, the effectiveness and justness of the courts are considered as one of the criteria for assessing the democracy and the protection of human rights and freedoms in society and in the state. Strong, independent and effective judicial power plays an important role in providing these values. After regaining its independence, Azerbaijan attaches great importance to the supremacy of law, protection of human rights and democracy. At the initiative of the President of the Republic of Azerbaijan Ilham Aliyev, who successfully follows the judicial and legal reforms, founded by the great leader Heydar Aliyev, qualitative changes took place in the development of justice in our country, legal bases for the court activities have been established, new courts have been established in the regions in order to enhance the capability of citizens to apply to the courts, the power of the courts has been expanded, the number of courts increased, and their financial maintenance has been improved, as well as substantial refinement of the judicial structure was achieved based on the transparent procedures of the selection of judges.

***Key words:*** *judicial-legal reforms, judicial power, judicial system, objectivity of justice, efficiency of legal proceedings*

## Giriş

**1991-ci il 18 oktyabrda qəbul olunmuş "Azərbaycan Respublikasının dövlət müstəqilliyi haqqında" Konstitusiya Aktı ilə** Azərbaycan öz dövlət müstəqilliyini elan etsə də, SSRİ-dən miras qalmış hüquq sistemi və qanunlar hüquqi və demokratik cəmiyyət quruculuğuna, qanunun aliliyinin təmin olunmasına, insan hüquq və azadlıqlarının müdafiəsinə təminat vermirdi. Cəmiyyətin gələcək inkişafı hüquq sahəsində islahatların həyata keçirilməsini, tamamilə yeni mütərəqqi və demokratik dəyərlərə əsaslanan hüquq və məhkəmə sisteminin, qanunvericilik bazasının formalaşdırılmasını tələb edirdi. (1)

Azərbaycan Respublikasında sözün əsl mənasında demokratik dəyərlərə əsaslanan hüquq sisteminin formalaşdırılması insanların hüquq və azadlıqlarını müdafiə etməyə, azad, müstəqil ədalət mühakiməsinin bərqərar olmasına yönəlmiş məhkəmə-hüquq islahatlarının həyata keçirilməsini zəruri etmişdir. Azərbaycan Respublikasında həyata keçirilən məhkəmə hüquq islahatlarını şərti olaraq dörd mərhələyə bölmək olar.

1995-ci ildə Konstitusiyanın qəbul edilməsi ilə məhkəmə-hüquq islahatının **birinci mərhələsi** başlamışdır. Konstitusiyanın qəbulu Azərbacanda demokratik quruluşun və hüquqi dövlətin möhkəm təməlini qoymuş, hüquqi islahatların aparılmasına zəmin yaratmışdır. Konstitusiyada demokratik cəmiyyətin qurulması, fəaliyyət göstərməsi və inkişafı üçün bütün müddəalar öz əksini tapdı. Bu inkişafın əsas komponenti aşkar, ədalətli səmərəli ədalət mühakiməsinin yaradılması məqsədi ilə olan məhkəmə-hüquq sisteminin islahatıdır.

Nəzərə çatdırmaq lazımdır ki, məhkəmə hakimiyyəti, onun hüquqi dövlətdə rolu və yeri ilə bağlı əsas ideyalar ölkənin Konstitusiyasına bünövrə kimi qoyulmuş konseptual əsaslardan irəli gəlir. Müstəqil Azərbaycanın Konstitusiyasında ilk dəfə olaraq məhkəmə hakimiyyəti anlayışı verilmişdir. Bununla da cəmiyyətdə yaranan bütün hüquq münasibətlərinin həlli məsələsi məhkəmə orqanlarının səlahiyyətinə aid edilmişdir. Məhkəmə hakimiyyətinə verilmiş yeni səlahiyyətlər nəzərə alınmaqla ölkə tarixində ilk dəfə olaraq əsas qanunda hakimlərin sərbəstliyi və müstəqilliyinin vacib təminatı - onların dəyişməzliyi prinsipləri reallaşmışdır. (2)

Hüquqi islahatların həyata keçirilməsi məqsədilə ölkə Prezidentinin 1996-cı il 21 fevral tarixli Sərəncamı ilə hüquqi islahatlar komissiyası yaradılmış, hüquqi dövlət quruculuğunda məhkəmə hakimiyyətinin rolu nəzərə alınmaqla 1998-ci il 01 dekabr tarixli Fərmanla dövlət başçısı yanında Məhkəmə-Hüquq Şurası yaradılmışdır.

Məhkəmə sistemi islahatının konsepsiyası aşağıdakı əsas məqsəd və vəzifələri müəyyən etmişdir. Hüquqi dövlət çərçivəsində məhkəmə hakimiyyətinin müstəqil fəaliyyət göstərməsinin təmin edilməsi, vətəndaşların məhkəməyə ədalətli araşdırma üçün müraciət etmək hüququnun təmin edilməsi, peşəkar hüquqi yardım almaq imkanı, məhkəmə qərarlarından şikayət vermək hüququnun həyata keçirilməsi və s.

Komissiya tərəfindən hazırlanmış "Məhkəmələr və hakimlər haqqında", "Konstitusiya Məhkəməsi haqqında" qanunlar ölkəmizdə məhkəmə-hüquq islahatları sahəsində atılan ilk, lakin çox vacib addım olmaqla müstəqil məhkəmə sisteminin yaradılmasına və fəaliyyət göstərməsinə imkan yaradır, konstitusiya nəzarəti ideyası qəbul edilir.

Konstitusiyada bəyan edilmiş məhkəmə hakimiyyətinin müstəqilliyi "Məhkəmələr və hakimlər haqqında" Azərbaycan Respublikasının Qanununda inkişaf etdirilərək öz real təminatını tapır və məhkəmə hakimiyyətinin müstəqil fəaliyyət göstərməsinə hüquqi zəmin yaradır.

Qanun yeni məhkəmə sistemini, onun təşkilati əsaslarını müəyyən edərək, məhkəmələrin və hakimlərin müstəqilliyinin təmin edilməsinə, hər kəsin hüquq və azadlıqlarının məhkəmədə müdafiəsinə təminatın verilməsinə yönəlir. (3)

Qeyd etmək lazımdır ki, sovet məhkəmə sistemi ikipilləli olmaqla, əlavə olaraq işlərə məhkəmədə nəzarət qaydasında baxılmasını da nəzərdə tuturdu. Ali Məhkəmə həm birinci instansiya, həm də kassasiya instansiyası məhkəməsi funksiyalarını həyata keçirməklə yanaşı, həm də qanuni qüvvəyə minmiş məhkəmə qərarlarına nəzarət qaydasında yenidən baxmaq hüququna malik idi. Yeni qanunvericilik müxtəlif məhkəmə instansiyalarının səlahiyyətlərinə aid olan bu funksiyaların Ali Məhkəmədə cəmləşməsini aradan qaldırır. "Məhkəmələr və hakimlər haqqında" Azərbaycan Respublikasının Qanunu köhnə məhkəmə quruluşundan tamamilə imtina edir və beynəlxalq standartlara cavab verən yeni məhkəmə quruluşunu ehtiva edir.

Bu islahatlardan sonra ölkəmizdə birinci, apellyasiya və kassasiya instansiyalı üçpilləli məhkəmə sistemi formalaşır. Yeni məhkəmə quruluşu işlərə birinci instansiya məhkəmələrində baxılmasına, onların hüquqa və fakta görə apellyasiya qaydasında yenidən baxılmasına, daha sonra isə məhkəmə qərarlarına hüquqa görə kassasiya qaydasında yoxlanılmasına imkan yaradır. Bu isə, öz növbəsində birinci instansiya məhkəməsinin buraxdığı səhvlərin yuxarı məhkəmə instansiyalarında aradan qaldırılmasına, işlərin mahiyyətcə və prosessual baxımdan düzgün və obyektiv həll edilməsinə, süründürməçiliyin aradan qaldınlmasına, köhnə sistemdən miras qalmış nəzarət instansiyasından imtina edilməsinə zəmin yaradır. (4, s. 443-446)

Azərbaycanın tarixində ilk olaraq 1998-ci il iyul ayında konstitusiya nəzarəti orqanı Konstitusiya Məhkəməsi yaradılmışdır.

2004-cü ilin dekabr ayından etibarən məhkəmə-hüquq islahatlarının **ikinci mərhələsi** başlanmışdır.

Ölkəmizdə baş verən sürətli sosial-iqtisadi inkişafı nəzərə alaraq, Avropanın siyasi, iqtisadi və hüquq məkanına inteqrasiyanı dövlət siyasətinin prioritetləri sırasına qaldıraraq demokratik cəmiyyətlərə xas məhkəmə-hüquq sisteminin fəaliyyətinə, insan hüquqlarının etibarlı müdafiəsinə nail olmaq üçün Azərbaycan Respublikasının Prezidenti mühüm təşəbbüslərlə çıxış edir. Belə ki, hüquq sisteminin və ədalət mühakiməsinin səmərəliliyinin artırılması məqsədilə qanunvercilik və institusional islahatlar daha da dərinləşdirilir. Praktiki tədbirlərin dairəsi isə genişləndirilir. Ədalət mühakiməsinin inkişafında keyfiyyətcə yeni dəyişikliklər baş verir. (5)

Bu məqsədlə məhkəmə fəaliyyətinin təkmilləşdirilməsi üzrə Azərbaycan-Avropa Şurası birgə işçi qrupu yaradılır, hakimlərin müstəqilliyi, seçilməsi, təyin edilməsi, ixtisasının artırılması və fəaliyyətinin qiymətləndirilməsi məsələləri üzrə müvafiq Fəaliyyət Planı hazırlanır. Avropa Şurası ekspertlərinin iştirakı ilə bir sıra normativ hüquqi sənədlər hazırlanır, Məhkəmələrin işinin təkmilləşdirilməsi və onun beynəlxalq tələblərə uyğunlaşdırılması məqsədilə "Məhkəmə-Hüquq Şurası haqqında" Azərbaycan Respublikasının Qanunu qəbul olunur, «Məhkəmələr və hakimlər haqqında» Azərbaycan Respublikasının Qanununa əsaslı dəyişikliklər edilir.

Yeni qanunvericiliyə görə hakimlərin özünüidarə orqanı kimi nəzərdə tutulan və demokratik əsaslarla formalaşdırılan Məhkəmə-Hüquq Şurası ölkəmizdə məhkəmə sisteminin təşkilini təmin edir, vakant hakim vəzifələrinə namizədlərin seçilməsinin təşkili, hakimlərin fəaliyyətinin qiymətləndirilməsi, vəzifədə irəli çəkilməsi, intizam məsuliyyətinə cəlb edilməsi, habelə məhkəmələr və hakimlərlə bağlı digər məsələləri səlahiyyəti daxilində həll edir.

Hakimlərin Seçki Komitəsi haqqında Əsasnamə, vakant hakim vəzifələrinə namizədlərin seçilməsi qaydaları təsdiq edilir, ölkəmizdə ilk dəfə olaraq əsasən hakimlərdən, habelə, prokurorluq, vəkillik, müvafiq icra hakimiyyəti və qanunvericilik orqanının nümayəndələrindən və hüquqşünas-alimlərdən ibarət Hakimlərin Seçki Komitəsi yaradılır. Hakimlərin Seçki Komitəsi vakant hakim vəzifələrini tutmaq istəyən şəxslərin sənədlərini toplayır, bu şəxslərə hakim peşəsinə yiyələnmək üçün şəffaf surətdə yazılı və şifahi imtahan təşkil edir, hakim vəzifəsinə namizədləri ilkin uzunmüddətli tədris kurslarına cəlb edir, müsahibə

yolu ilə onların peşə yararlılığını müəyyən edir. Hakimlərin səlahiyyət müddəti son yaş həddinə - 65 yaşınadək uzadılır. (6)

2005-ci ilin sentyabr ayından yeni hakimlərin seçilməsi prosesi başlanır və bu sahədə beynəlxalq təşkilatlarla sıx əməkdaşlıq edilir. İmtahan prosesi onlar tərəfindən müsbət qiymətləndirilir, imtahanın açıq və şəffaf keçirildiyi qeyd edilir.

Məhkəmə-hüquq islahatlarının ikinci mərhələsi məhkəmələrin müstəqilliyinin gücləndirilməsi, məhkəmələrin fəaliyyətində şəffaflığın təmin edilməsi, hakimlərin seçim prosedurunun yeni prinsiplər əsasında müəyyən edilməsi, fəaliyyətlərində sui-istifadəyə yol vermiş hakimlər barədə intizam məsuliyyətinin gücləndirilməsi, məhkəmə hakimiyyətinin özünüidarə funksiyalarını həyata keçirən mahiyyətcə yeni Məhkəmə-Hüquq Şurasının təşkil edilməsi, vakant hakim vəzifələrinə namizədlərin seçilməsi prosesini həyata keçirən yeni qurumun - Hakimlərin Seçki Komitəsinin yaradılması məsələlərini əhatə edərək hüquq sisteminin müasirləşdirilməsinə zəmin yaradır.

Məhkəmə-hüquq islahatlarının məntiqi davamı kimi "Azərbaycan Respublikasında məhkəmə sisteminin müasirləşdirilməsi və "Azərbaycan Respublikasının bəzi qanunvericilik aktlarına dəyişikliklər və əlavələr edilməsi haqqında" Azərbaycan Respublikası Qanununun tətbiq edilməsi barədə" Azərbaycan Respublikasının Prezidentinin 2006-cı il 19 yanvar tarixli 352 nömrəli Fərmanı məhkəmə sisteminin müasirləşdirilməsi və inkişafında mühüm əhəmiyyət kəsb edir. Bu Fərmanla məhkəmə islahatlarının **üçüncü mərhələsi** başlanmışdır.

Fərmana əsasən vətəndaşların məhkəmələrə müraciət imkanlarının asanlaşdırılması, məhkəmələrdə süründürməçilik və digər hüquq pozuntuları hallarının aradan qaldırılması, hakimlərin iş yükünün azaldılması, məhkəmələrin yeni informasiya texnologiyaları ilə təmin edilməsinə dair müəyyən edilmiş vəzifələrin həyata keçirilməsi üçün regionların inkişafı nəzərə alınmaqla Bakı, Gəncə, Sumqayıt, Şəki və Şirvan şəhərlərində regional Apellyasiya və yerli İqtisad Məhkəmələri, Naxçıvan Muxtar Respublikasında isə Ağır Cinayətlərə dair işlər üzrə məhkəmə təşkil edilmişdir. Ölkədə ədalət mühakiməsinin yüksək səviyyədə həyata keçirilməsi üçün hər cür şərait yaradılmış, Azərbaycan Respublikasının Məhkəmə sisteminə daxil olan məhkəmələrin hakimlərinin ümumi sayı 600 nəfər müəyyən edilmiş, eyni zamanda Ağır Cinayətlərə Dair İşlər üzrə Azərbaycan Respublikasının Məhkəməsi ləğv edilərək, onun əvəzinə Bakı, Gəncə, Lənkəran və Şəki Ağır Cinayətlər Məhkəməsi və habelə yerli İqtisad Məhkəmələrinin bazasında İnzibati İqtisad məhkəmələri yaradılmış, hakimlərin maddi təminatı yaxşılaşdırılaraq, onların əmək haqqı əvvəlki illərdən fərqli olaraq dəfələrlə artırılmış, məhkəmələrin maddi texniki bazası möhkəmləndirilmişdir. (7)

Yeri gəlmişkən qeyd etmək lazımdır ki, adı çəkilən Fərmanda digər məsələlərlə yanaşı İnsan Hüquqları üzrə Avropa Məhkəməsinin presedent hüququnun öyrənilməsi işinin təşkili və onun məhkəmə təcrübəsində nəzərə alınması tövsiyyə olunmuşdur.

Ölkənin davamlı tərəqqisinin təmin edilməsi üçün bütün sahələrdə həyata keçirilən islahatlar "Məhkəmə-hüquq sistemində islahatların dərinləşdirilməsi haqqında" Azərbaycan Respublikası Prezidentinin 2019-cu il 3 aprel tarixli 604 nömrəli Fərmanının qəbul edilməsini şərtləndirmişdir. Həmin Fərman məhkəmə-hüquq sisteminin inkişafında dördüncü mərhələnin başlanmasının və məhkəmə-hüquq islahatlarının davamlılığının real göstəricisidir. Fərmanın məqsədi müasir dövrün tələblərinə cavab verən, cəmiyyətdə yüksək nüfuza malik ədalət mühakiməsinin formalaşdırılması prosesinin sürətləndirilməsidir. Nəzərdə tutulan məqsədə nail olunması üçün vətəndaşların məhkəməyə müraciət etmək imkanlarının daha da genişləndirilməsi, məhkəmələrin fəaliyyətində şəffaflığın artırılması, məhkəmə icraatının səmərəliliyinin yüksəldilməsi, məhkəmə qərarlarının tam və vaxtında icra edilməsinin təmin olunması, süründürməçiliyin və digər neqativ halların aradan qaldırılması üçün görülən tədbirlərin gücləndirilməsi kimi vəzifələr qarşıya qoyulmuşdur. (8) Eyni zamanda sözügedən Fərmanda ədalət mühakiməsi mexanizmlərinin effektiv fəaliyyətinin təmin edilməsi üçün hakim və məhkəmə aparatı işçilərinin sosial müdafiəsinin daha da yaxşılaşdırılmalı, müvafiq infrastrukturun yenilənməsi işlərinin davam etdirilməli, məhkəmə icraatında müasir informasiya texnologiyalarının tətbiqinin üstünlüklərindən hərtərəfli istifadə edilməli olduğu vurğulanmışdır. (9)

## Nəticə

Yekun olaraq qeyd etmək lazımdır ki, məhkəmə-hüquq sisteminin təkmilləşdirilməsi konsepsiyası çərçivəsində həyata keçirilən islahatlar ədalət mühakiməsinin keyfiyyətini və səmərəliliyini artırmaqla, ümumilikdə hüquq sisteminin inkişafına mühüm təsir göstərmişdir. Belə ki, həyata keçirilən məhkəmə-hüquq islahatları məhkəmə sistemində əsaslı dəyişikliklərin aparılmasına, bu sistemin daha mütərəqqi olmasına, təkmilləşməsinə və müstəqil fəaliyyət göstərməsinə imkan yaratmışdır. Eyni zamanda aparılan məhkəmə-hüquq islahatları vətəndaşların hüquqlarının məhkəmələrdə daha etibarlı müdafiəsini təmin etməklə məhkəmələrə etimadın və məhkəmə sisteminin nüfuzunun daha da yüksəldilməsinə səbəb olmuşdur.

**Ədəbiyyat**

1. "Azərbaycan Respublikasının dövlət müstəqilliyi haqqında" Konstitusiya Aktı. 1991-ci il 18 oktyabr. http:// files.preslib.az/projects/republic/az/azr4_2.pdf
2. Azərbaycan Respublikasının Konstitusiyası. 1995-ci il 12 noyabr, № 00. http://e-qanun.az/framework/897
3. "Məhkəmələr və hakimlər haqqında" Azərbaycan Respublikasının Qanunu. 1997-ci il 10 iyun, № 310-IQ. http: //e-qanun.gov.az/framework/3933
4. Əsgərov Z. Konstitusiya hüququ. Dərslik. Bakı, Bakı Universiteti nəşriyyatı. 2011. 760 s.
5. http://www.supremecourt.gov.az/post/view/242
6. https://republic.preslib.az/az_a6.html
7. "Azərbaycan Respublikasında məhkəmə sisteminin müasirləşdirilməsi və "Azərbaycan Respublikasının bəzi qanunvericilik aktlarına dəyişikliklər və əlavələr edilməsi haqqında" Azərbaycan Respublikası Qanununun tətbiq edilməsi barədə" Azərbaycan Respublikasının Prezidentinin 2006-cı il 19 yanvar tarixli 352 nömrəli Fərmanı. http://www.e-qanun.az/framework/11357
8. http://www.supremecourt.gov.az/post/view/978
9. "Məhkəmə-hüquq sistemində islahatların dərinləşdirilməsi haqqında" Azərbaycan Respublikası Prezidentinin 2019-cu il 3 aprel tarixli 604 nömrəli Fərmanı. http://www.e-qanun.az/framework/41813

**Rəyçi: dos. N.Şükürov**

Göndərilib: 22.02.2021 Qəbul edilib: 25.02.2021

DOI: 10.36719/2663-4619/63/136-139

**Farid Vidadi Jafarov**
Baku Slavic University
student
ceferovf105@gmail.com

# WHAT IS DEMOCRACY AND HOW HAS IT CHANGED OVER TIME?

**Summary**

Democracy is one of the fundamental priorities of modern civil societies and the mainstay of nations and governments. Some people believe that democracy was born in United States. But democracy was born thousands years ago in Ancient Greek. Today democracy is only alternative choice against authoritarian and repressive regimes emerges as one of the most eligible mode of administration. In this article, we will look at the types of democracies and how democracy has changed from first version to present version. Also, why philosophers' divided on democracy?

***Key words****: history, democracy, magna carta, turks, vikings, middle ages, modern democracy*

## Introduction

What is democracy? Why democracy is important? First of all, democracy is equality of all citizens. Not only equality in front of law but also equality of opportunities. The word of "democracy" consist of two Greek words - power (kratos) and people (demos). It is absolute power belongs to people instead of dictators and inherited kings-aristocrats. Democracy introduce us demand and protect our laws, ability to elect and be elected, be equal in any field. On the other hand, we cannot deny that democracy has changed during timeline. In addition, it collapsed several times and even replaced by its updated version. But how democracy was created? Why it was created? What is its main purpose first times?

## Democracy in Ancient Greece

If we are talking about democracy, we automatically remember Ancient Greece democracy. In Greece, there were many small cities (polis) and they had own kings, legislation. Actually just Athena had people's governance. It means Athena democracy was unique. But unfortunately, philosophers were divided on democracy. Aristocracy and Democracy were opposite each other's. Some philosopher (such Empedocles, Anaxagoras. Democritus) supported democracy and they believe it was suitable for governance. On the other hand, others (such Plato, Socrates, Aristotle and Pythagoras) were not keen on democracy. For example, Democritus faced with leaving his polis (Acrogas) because of that. Empedocles refused to be king of his polis. He preferred democracy rather than others.

On contrast, Pythagoras was conservative, he quoted that:

"Human consist of three parts- head, main body, legs and arms. Like human, society consist of three parts- the wise, soldiers and citizens. Human body is managed by head. Society should be managed by the wise". Plato and Aristotle did not believed equality and they supported aristocracy. Some historians say that Aristotle was not supporter of aristocracy, he just believed that anyone can manage government but after learning how to do this. Socrates had negative view on democracy. He believed that only educated part of the citizens should control government. (Platon)

In addition, we can show that Solon and Pericles were different. Unlike others, they preferred to use democracy in specific field. Solon used democracy just in law, Pericles used democracy only in government administration.

Ancient Greece democracy also called classic democracy. Despite passed thousands years, even today it doesn't lost its actuality.

## Democracy in Ancient Rome

It was called "republic" (in Latin "res publica") in Rome. In the early days, only patricians (aristocrats) could participate in public administration. However, as a result of the development of society, citizens (in Rome they were called "plebs") also had the right to participate in this procedure. (Brown, 2016)

Before tyranny, Rome was managed by the senate. The Senate was look like modern parliament. The wise part of people discussed and made decisions. Until Caesar, dictator was an official position which was elected by the Senate (for a maximum period of 6 months,)

Neither Caesar nor Pompey wanted Cicero as an enemy and both men appealed to him for his allegiance. Cicero chose to side with Pompey at Civil War (49-45 BC). After Civil War, in 46 B.C. Caesar was declared himself "Dictator perpetus" (endless dictator),

Cicero blamed military regime and he was stand against of military coups and dictators. Cicero gave a speech at the senate about that.

Due to that, Cicero left Rome. He had read Socrates's plays but he did not agree with him absolutely. After traveling, he backed to Rome. Aristocrats showed him as danger and Cicero was killed dramatically. His body was shredded and his head was cut. Democracy lost again. From my point of view, it was not perfect time to try to protect previous regime and blame military regime. As we know that, after suicide of J. Caesar, totalitarian regime was not end. And again Civil War started. Future emperors (such Caligula, Nero.) did crazy things and kept the power on their hands.

Rome's democracy called "republic democracy"

## Democracy in Vikings

Well, we know about their life style from Viking series. But history and TV series are not similar. We review historical background. In Vikings, the council was called "Tring". They didn't have information about Ancient Greece and Rome democracy. They made their own system which based on equality. But that was for freedom people. Like Romans and Greeks, they had slaves. Secondly, they were not equal in property. Generally, Viking society consisted of 4 classes - king, aristocrats, free people and slaves. Even after being freedom, previous slaves were partially dependent to former masters.

## Democracy in Turks

Yes it could be sound interesting but Ancient Turks had democratic life as Ancient Greece. Unfortunately, Ancients Turks were wanderer. That's why we did not have enough information about their life style and their rules. Due to last discoveries, many historians agree with that. Until sultanate, Turks did tend to live with gender equality. Men and women did fight together against enemies. Women did stand with their husband at wars, sports, celebrities and so on. (White, 2003)

Queen Tomyris (Queen of the Scythia) was one of them. Historians note this fact at his manuscripts. In many Turk crews, gender equality, elections system, taking advice from the wise were parts of social life.

Generally their law system called "Töre" (in Turkish) and his law system based on ancient Turks' moral. We can describe this like that crew leaders were elected by the wise, the wise members were elected by other members of crew. Before staring war, travelling or other important event crew leader ask advice from the wise. It was prototype of modern parliament. Fortunately, last decades we discover many things about our ancestors. Our ancestors lived in a large area (from Arctic zone to Europe) and despite area difference, their life style, manners are similar. After sultanate many Turks crews did tend to live as Arabs.

## Democracy in Middle Era

If we investigate this age, we can see declaration of Magna Carta.

What is Magna Carta?

This declaration is first document to limit authority of Royal family. Everything started because of King Henry. King Henry was one of the craziest kings. He did whatever he want. For instance, he raised taxes, started wars and killed someone just for fun. Hence he hadn't good relations with Pope. Thus barons rebelled against King Henry. Due to critical rebellion, Magna Carta was written (1215).

According to Magna Carta, no one should not be arrested or deprived from property without evidence or judge decision. Civil war stopped. Ironically, this document was written in Latin language and aristocrats (king and barons) were talking in French language. Of course English people didn't understand anything. Moreover, this document was for free people. Large fraction of people did belong to barons. Naturally, this documents wasn't satisfactory. But anyway, it was important document for limiting authority of Royal family.

Thousands years later, Declaration of Human Rights was accented based on Magna Carta (December 10, 1948). Also, "800. Annual Celebration of Magna Carta" was celebrated in 2015. In 1649, strange as it may sound, England was proclaimed a republic. Four years later replaced by previous form. May be Socrates, Aristotle was right. Large fraction of people were not ready to accept democracy. They did not have any idea what was it and how to manage it?

In 1265, English Supreme Council called "Parliament". Today almost many democratic governments have parliament. The homeland of parliament is England.

## Philosophers' ideas on democracy (Middle Era)

First of all, we can talk about Thomas Hobbs. English philosopher is best known for his political philosophy. Hobbes believed that understanding physiology of human was necessary in order to understand the role of the government. In contrast, is ideas and Pythagoras (He quoted that body parts and society are similar) ideas were different. Hobbes believed that material item such as property, influenced human nature. Because of that, everyone should have the same things. He thought that all people should have equal rights and nobody should have more power over anyone else (besides the King, who should have absolute power).

John Locke argued about that everyone should have property freedom. Without property rights, labor was nothing. Locke's ideal form of government was a representative government such as English Parliament. In his Second Treatise of Government, Locke noted that the duty of government to protect human rights which involved 3 main rights - life, liberty and property. (Kelly, 2007)

## Democracy in America

During Civil War American Council agreed "Declaration of Independence" (July 4, 1776). Americans preferred to liberalism not monarchy. This document was also first document identify the human freedom. Unfortunately. This document wasn't include slavery, massacre of America' local residents and deportation of them. Anyway, it was important document and after that French rebellions made "Declaration of Human and Civil Rights" based on "Declaration of Independence".

## Democracy in 20. Century

After WWI and WWII, democracy became main priority. (htt1) After the World War II, The United Nations (UN) formally created in October 1945 was established as a world government that would maintain international order, but many forces that worked against such an outcome included the division of the world into two large political blocs identified with the North Atlantic Treaty Organization (NATO) and the Warsaw Pact. But during Cold War both western and socialist sides blamed each other's to limit people's right. During this period of time democracy became second priority, governments preferred to keep their independence rather than being democratic.

On the one hand, Soviet regime introduce "Berlin Wall" project and spitted city. Due to this crazy project, even today some senior citizens cannot adapt new life style.

On the other hand, USA introduce McCarthyism project. And socialist were hunted in America from end of 1940's to end of 1950's. During one decade government influence people's carriers, life, political views.

## Present day

After being collapsed SSSR, many countries became freedom. Usually western countries and developed countries agree with that post- soviet countries are not democratic. These countries do not have independent legislative system, electoral system and they are managed by dictators. But we shouldn't forget that democracy is the choice of people, the attitude to democracy is the choice of the masses

But we can see many aspects which are typical of post-soviet countries. All of them were managed by socialist authorities and they always felt the pressure of SSSR. Some of them prefer to adapt based on several stages. Eastern post-soviet countries aim to EU (except Belarus) and some post-soviet countries are already members of EU such Poland, Estonia, Lithuania, Latvia. Furthermore, Eastern Partnership was created by Poland and Sweden efforts. The aim of this partnership is develop multiple relations (include trade, cultural, travelling) with post-soviet countries. Eastern Partnership covers six countries- Azerbaijan, Armenia, Georgia, Moldova, Belarus and Ukraine.

## Conclusion

Based on research and notes we can say that democracy is perceived differently in each society. Most of Ancient Greece philosopher believed that democracy could have repercussions (such as coup). And simple people did not have enough experience and ideas to use democracy. Because their ideas, they were blamed and even banished. From Greece to Rome, we can see that Rome was more conservative than Ancient Greece. In Rome, system developed. Lawyers dealt with problems of democracy, not philosophers. Also Ancient Turks lived based on main democratic rights such as gender quality. System always develop itself. During Middle Ages some philosophers introduced new ideas on democracy. Despite "classic" and "republic" versions, Locke, Hobbs believed human should have property rights. Based on these new and equal ideas America created new type of democracy. Europeans philosophers could not do that in Europe but inspired thinkers at the other side of ocean. After "Declaration of Independence" the monarchy began to

collapse. And after that, the Church separated from government. Every thinker inspired by previous thinker. "In Ancient Greece, defeated side had to leave city(polis). But in modern world, modern liberal democracy provides legitimate protection for the defeated side." (Dahl, 2004: 136) After Cold war and being collapsed SSSR, totalitarian governments replaced by democratic governments. This article reviewed how democracy changed from Ancient Greece democracy to the present. On the other hand, historians can search how democracy developed in ancient civilizations. Did Turks, Iranian crews and other eastern civilization have more developed democratic system than we thing?

## References

1. (n.d.). Retrieved from https://www.infoplease.com/encyclopedia/social-science/government/concepts/ natural-rights
2. Brown, Z.S. (2016). Retrieved from http://www.inquiriesjournal.com/articles/1492/how-democratic-was-the-roman-republic-the-theory-and-practice-of-an-archetypal-democracy
3. Brown, Z.S. (2016). *How Democratic Was The Roman Republic? The Theory and Practice of an Archetypal Democracy*. Retrieved from http://www.inquiriesjournal.com/articles/1492/how-democratic-was-the-roman-republic-the-theory-and-practice-of-an-archetypal-democracy
4. Curley, E. (1994). *Leviathan.* Indianapolis: Hackett Publishing.
5. Dahl, R. (2004). *Demokratiya Haqqında.* (S. Natiq , Tərc.) Baku: Far Center, 23-23.
6. Dahl, R. (2004). Demokratiya Haqqında. (S. Natiq , Tərc.) Baku: Far Center, 136.
7. Dahl R.A. (2021, February 11). *Democracy*. Retrieved from britannica.com: https://www.britannica.com/ topic/ democracy
8. Editors, H. (2019, June 10). *HISTORY*. Retrieved from https://www.history.com/topics/ancient-history/ marcus-tullius-cicero
9. Kelly, P. (2007). *Locke's Second Treatise of Government.* London: Continuum Publishing.
10. Platon. (n.d.). *Book Six of The Republic*.
11. Stefanovska. (2015). The Legacy Of Magna Carta And The Rule Of Law In The Republic Of Macedonia. *SEEU Review*, 198.
12. Stefanovska, V. (2015). The Legacy Of Magna Carta And The Rule Of Law In The Republic Of Macedonia. *SEEU Review*, 201.
13. White, J.B. (2003). State Feminism, Modernization, and the Turkish Republican Woman. *NWSA Journal*, 145-159.
14. Winroth, A. (2014). *The Age of the Vikings.* Princeton University Press. Winroth, A. (2014). *The Age of the Vikings.* Princeton University Press

**Rəyçi: dos. Ş.Əliyev**

Göndərilib: 22.02.2021 Qəbul edilib: 25.02.2021

